QƏZET 01.02.1958-ci
İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Aprel
2017
№ 2 (1081)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## 1941-1945-ci illər İkinci Dünya müharibəsi iştirakçılarına, həlak olmuş və ya sonralar vəfat etmiş döyüşçülərin dul arvadlarına, arxa cəbhədə fədakar əməyinə görə orden və medallarla təltif edilmiş şəxslərə birdəfəlik maddi yardım verilməsi haqqında

## Azərbaycan Respublikası Prezidentinin Sərəncamı



Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq 1941-1945-ci illər İkinci Dünya müharibəsində Qələbənin 72-ci ildönümü ilə əlaqədar **qərara alıram:**

1. 1941-1945-ci illər İkinci Dünya müharibəsi iştirakçılarına 1000,0 (min) manat məbləğində, İkinci Dünya müharibəsində həlak olmuş və ya sonralar vəfat etmiş döyüşçülərin dul arvadlarına, həmin dövrdə arxa cəbhədə fədakar əməyinə görə orden və medallarla təltif edilmiş şəxslərə, İkinci Dünya müharibəsi illərində döyüş cəbhələrinin arxa hüdudları, yaxud döyüşən donanmaların əməliyyat zonaları daxilində ordunun və donanmanın mənafeyi üçün tapşırıqları yerinə yetirmiş xüsusi birləşmələrin işçilərinə, İkinci Dünya müharibəsi dövründə Leninqrad şəhərinin müdafiəsinə görə müvafiq medal və döş nişanı ilə təltif edilmiş şəxslərə, habelə Leninqrad şəhərinin mühasirəsi iştirakçılarına 500,0 (beş yüz) manat məbləğində birdəfəlik maddi yardım verilsin.

2. Bu sərəncamın 1-ci hissəsinin icrası məqsədi ilə:

2.1. Azərbaycan Respublikasının 2017-ci il dövlət büdcəsində nəzərdə tutulmuş Azərbaycan Respublikası Prezidentinin Ehtiyat Fondundan 7,2 milyon (yeddi milyon iki yüz min) manat ayrılsın;

2.2. Azərbaycan Respublikasının Maliyyə Nazirliyi həmin vəsaitin Azərbaycan Respublikasının Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin xüsusi hesabına köçürülməsini təmin etsin;

2.3. Azərbaycan Respublikasının Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi birdəfəlik maddi yardımın bu sərəncamın 1-ci hissəsində nəzərdə tutulmuş şəxslərə çatdırılmasını təmin etsin.

3. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 24 aprel 2017-ci il*

# "Azərbaycanlıların soyqırımı" kitabının təqdimatı

Səbail Rayon İcra Hakimiyyətinin təşəbbüsü, Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının və Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) birgə təşkilatçılığı ilə ötən il keçirilmiş "31 Mart-Azərbaycanlıların Soyqırımı Günüdür" mövzusunda elmi-praktik konfransda buradakı çıxışların əsasında kitab hazırlanması qərara alınmışdı. Mart soyqırımının ildönümü günlərində isə təşkilatçıların birgə hazırladığı ADPU-nun professor, müəllim və tələbələrinin, tarixçilərin konfransdakı çıxışları, mövzulara aid xeyli fotoşəkil toplanmış nəfis tərtibatlı "Azərbaycanlıların soyqırımı" adlı kitab işıq üzü görmüşdür.

Aprelin 3-də rayon rəhbərliyi, dövlət qurumların nümayəndələri, Milli Məclis üzvləri, elm, təhsil, incəsənət və din xadimləri, ziyalıların, gənclərin, ağsaqqalların, veteranların və ictimaiyyətin, rayondakı ali məktəblərin pedaqoji kollektivlərinin iştirakı ilə Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Azərbaycan Tarixi Muzeyində kitabın təqdimat mərasimi keçirilmişdir.

Təqdimat mərasimində çıxış edən Səbail Rayon İcra Hakimiyyətinin başçısı Eldar Əzizov qeyd etmişdir ki, Azərbaycan xalqı XX əsrdə bir neçə dəfə soyqırımlara məruz qalmışdır. Uzun illər azərbaycanlıların əzəli torpaqlarına sahib çıxmaq və burada «Böyük Ermənistan» yaratmaq xülyaları ilə yaşayan erməni qəsbkarları 1918-ci ildə Bakı, Şamaxı, Quba qəzalarında, Qarabağda, Zəngəzurda, Naxçıvanda, Lənkəranda və Azərbaycanın başqa bölgələrində minlərlə dinc azərbaycanlı əhalini yalnız milli mənsubiyyətinə görə məhv etmiş, milli memarlıq incilərini, məktəbləri, xəstəxanaları, məscid və digər abidələri dağıtmışlar.

Ötən əsrin 80-ci illərində isə SSRİ-nin süqutunun sürətlənməsindən istifadə edən ermənilər öz havadarlarının köməyi ilə Dağlıq Qarabağın Ermənistana birləşdirilməsi üçün Azərbaycana qarşı birbaşa hərbi təcavüzə başladılar. 1992-ci ilin fevralında isə Xocalıda azərbaycanlılara qarşı növbəti soyqırımı törədildi, daha sonra isə torpaqlarımızın 20 faizi işğal olundu.

Azərbaycan müstəqillik qazandıqdan sonra uzun illər gizli saxlanılan həqiqətlər açıldı, təhrif edilən hadisələr əsl qiymətini aldı. Ümummilli liderimiz Heydər Əliyevin 1998-ci il martın 26-da imzaladığı Fərmanla 31 mart Azərbaycanlıların Soyqırım Günü elan edildi. Bununla da Azərbaycan tarixində erməni məsələsinə münasibətdə yeni strategiya müəyyənləşdi. Bu, həm də Azərbaycan xalqının əsrlər boyu üzləşdiyi mərhumiyyətlərə rəhbəri Heydər Əliyev olan dövlətin verdiyi əsl tarixi qiymət idi.



Ulu Öndərin ideya və əməllərini yaşadan, dünyada yeni tipli lider kimi tanınan, bugünkü çətin və mürəkkəb dövrdə müstəqil siyasət yürüdən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev dövlətçilik maraqlarımızın qorunmasında, ölkəmizin ərazi bütövlüyünün bərpa olunması istiqamətində qəti və prinsipial mövqe nümayiş etdirir. Dövlət başçımızın yorulmaz fəaliyyəti sayəsində Azərbaycan inkişaf edib möhkəmlənərək dünyanın aparıcı ölkələri sırasında öz layiqli yerini tutub. Qarabağ probleminin həlli istiqamətində mərhələli addımlar atılır, ölkənin iqtisadi gücü artır və siyasi nüfuzu güclənir.

Eldar Əzizov vurğulamışdır ki, cənab Prezidentin yürütdüyü bu siyasət yeganə düzgün, alternativsiz və müvəffəqiyyət qazandıracaq siyasətdir və xalqımız bu siyasəti yekdilliklə dəstəkləyir.

Daha sonra çıxış edən YAP-ın Səbail rayon təşkilatının sədri, Milli Məclisin deputatı, professor Şəmsəddin Hacıyev, ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Azərbaycan Dövlət İqtisad Universitetinin (UNEC) rektoru, professor Ədalət Muradov, AMEA-nın Azərbaycan Tarixi Muzeyinin direktoru, akademik Nailə Vəlixanlı 1918-ci il hadisələri, sonrakı illərdə ermənilərin Azərbaycan xalqına qarşı törətdikləri təcavüz faktları, onların beynəlxalq ictimaiyyətə çatdırılması istiqamətində görülmüş işlər barədə danışaraq qeyd etmişlər ki, çap olunmuş kitab uzun illər boyunca mənfur qonşularımızın azərbaycanlalara və digər xalqlara qarşı törətdikləri soyqırımların dərindən və hərtərəfli öyrənilməsində mühüm əhəmiyyətə malikdir. Kitab gələcək nəslin tariximizi daha dərindən öyrənmələri, onların maarifləndirilməsi istiqamətində mühüm rol oynayacaqdır.

Digər çıxışçılar bildirmişlər ki, hər bir faciənin elmi cəhətdən araşdırılması və tarixi faktların dünya ictimaiyyətinə dolğun şəkildə çatdırılması həmin hadisəyə obyektiv siyasi-hüquqi qiymətin verilməsinə, günahkarların layiqli cəzasına çatmasına və gələcəkdə belə halların qarşısının alınmasına həlledici təsir göstərə bilər.

Bununla əlaqədar rayonun 163 nömrəli tam orta məktəbinin direktoru Sevil Cavadova məktəb kollektivi adından kitabın ingilis dilinə tərcümə edilməsi və bu işin məktəb kollektivinə həvalə olunması təklifini irəli sürdü.

Təklif razılıqla qarşılandı və növbəti ildə kitabın ingilis dili variantının hazırlanaraq təqdimatının keçirilməsi və kitabın beynəlxalq ictimaiyyətə çatdırılması qərara alındı.

**Mənsur İbrahimli**

# Thomson Reuters şirkətinin elmi bazasından istifadə qaydaları ilə bağlı təlim

Aprelin 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Thomson Reuters şirkətinin Azərbaycan üzrə nümayəndəsi, İnsan resursları üzrə ekspert Aygün Babazadə təmsil etdiyi şirkətin elmi bazasından istifadə qaydaları ilə bağlı təlim keçirib. Təlimdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri iştirak ediblər.



Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, ölkə rəhbərliyi Thomson Reuters şirkətinin elmi bazasından istifadə etmək, müasir dünyada elm və təhsil sahəsində gedən proseslərlə tanış olmaq üçün şərait yaradıb. Təhsil Nazirliyi (TN) 2015-ci ildə, Azərbaycan Milli Elmlər Akademiyası (AMEA) isə 2016-cı ildə bu şirkətlə dövri elmi nəşrlərlə bağlı müqavilə imzalayıb. Belə təlimlər alimlərimizin elmi-tədqiqat işlərinin impakt-faktorlu elmi jurnallarda dərc olunması və nəticə etibarilə həmin əsərlərin dünya səviyyəsinə çıxması baxımından mühüm əhəmiyyət kəsb edir. Rektor sonda təlimin keçirilməsinə görə Aygün Babazadəyə təşəkkür edib.

Təlimdə Aygün Babazadə slayd vasitəsi ilə Thomson Reuters şirkətinin elmi bazasından praktiki istifadə qaydaları, bazanın üstünlükləri, tədqiqatın aparılması, jurnalların seçilməsi, nəşrə hazırlaşmaq, elmi reputasiyanın qazanılması, nəticələrin nəşri barədə ətraflı məlumat verib. Bildirib ki, hazırda dünyada 100 mindən çox qeydiyyatdan keçmiş elmi jurnal var. Onlardan 18 mini daha nüfuzlu elmi jurnal kimi tanınır. 18 min jurnaldan 13 mini impakt-faktorludur. İmpakt-faktorlu elmi jurnalların 80-85 faizi ingilis dilində nəşr olunur. Elmi jurnalların seçim meyarlarına nəşriyyat standartları, beynəlxalq redaksiya tərkibi, jurnalın məzmunu, istinadların təhlili və s. daxildir. Təlimdə A.Babazadə impakt-faktorlu elmi jurnallara daxil olma, effektli axtarış, qeydiyyatdan keçmə və istifadə qaydaları haqqında geniş məlumat verib.

Təlimdə Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov, professor Ələkbər Qurbanov, professor Mirzəli Murquzov, professor Edil Eyvazov, professor Nailə Verdizadə, dosent Şahin Pənahov, dosent Laçın Həsənova, dosent Gülçöhrə Alıyeva, dosent Yaşar Hüseynəliyev, dosent Fəxrəddin Yusifov çıxış edərək elm sahəsində yeni istiqamətlərin, meyil və təzahürlərin ardıcıl izlənilməsi, elmi-tədqiqat işlərinin səviyyəsinin yüksəldilməsi, informasiya resurslarından istifadə yolları, əqli mülkiyyətdən səmərəli istifadə və elmi əsərlərin impakt-faktorlu jurnallarda dərc olunması ilə bağlı maraqlı təkliflərlə çıxış ediblər. Belə təlimlərin gələcəkdə daha geniş tərkibdə keçirilməsi məqsədəuyğun bilinib.

**Mahirə Mustafayeva**

# ADPU-nun “Twinning” layihəsi çərçivəsində akkreditasiyası

Aprelin 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) “Twinning” layihəsinin özünütəhlil hesabatının qiymətləndirilməsi ilə bağlı tədbir keçirilib. Tədbirdə Finlandiya və Estoniyadan olan təhsil ekspertləri, ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, Elmi Şuranın və Dissertasiya Şurasının üzvləri, struktur bölmələrinin rəhbərləri, müəllim və tyutorları, məzunları, tələbələri, ADPU-nun baza məktəbi olan Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbin rəhbərliyi, müəllimləri və digər ali məktəblərin müəllim və tələbələri iştirak ediblər. Qeyd edək ki, Azərbaycan ali təhsilinin Avropa ali təhsil məkanının tələblərinə daha da uyğunlaşdırılması layihəsi çərçivəsində ali təhsilin keyfiyyət təminatı üzrə Avropa Standartları və Təlimatlarına uyğun 3 ali təhsil müəssisəsi-Azərbaycan Dövlət Pedaqoji Universiteti, Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC) və Azərbaycan Texniki Universiteti (AzTU) pilot qiymətləndirmənin keçirilməsi üçün seçilib. Bu məqsədlə Finlandiya və Estoniyadan olan təhsil ekspertləri, eləcə də müvafiq təlim keçmiş yerli ekspertlərdən qrup 11-13 apreldə ADPU-nun akkreditasiyasını həyata keçirəcək. Universitetin strateji idarəetməsi, tədris proqramları, elmi-tədqiqat fəaliyyəti, insan resursları, tələbələrlə iş, təlim resursları və tələbələrə dəstək istiqamətləri üzrə həyata keçiriləcək akkreditasiya onun güclü tərəflərini aşkara çıxarmaqla yanaşı, inkişafa ehtiyac duyulan sahələrinin müəyyən edilməsinə xidmət edir. ADPU-nun təqdim etdiyi özünütəhlil hesabatına əsasən universitetin inzibati, pedaqoji və tələbə heyəti ilə müsahibələrin keçirilməsi planlaşdırılır. İki ay müddətində beynəlxalq ekspert qrupu yekun hesabat hazırlayıb Təhsil Nazirliyinə və ADPU-ya təqdim edəcək.

Tədbirdə çıxış edən Finlandiya və Estoniyadan olan təhsil ekspertləri Azərbaycanın ali təhsil sahəsində keyfiyyətcə yeni bir mərhələnin başlandığını və bu layihənin ali təhsilin keyfiyyətin yüksəldilməsinə səmərəli təsir edəcəyini bildirərək layihə iştirakçılarına uğurlar arzulayıblar.



ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov, Elmi işləri üzrə prorektoru, professor Asəf Zamanov, Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, Ümumi işlər üzrə prorektoru Əbdul Xalıqov “Twinning” layihəsi çərçivəsində həyata keçirilən seminarlar, təlimlər, özünütəhlil prosesinə maraqlı qurumların nümayəndələrinin cəlb olunması, onların fikir və təkliflərinin nəzərə alınması, birgə keçirilən tədbirlər, eləcə də professor-müəllim heyətinin bilik, səriştə və bacarıqlarının yüksəldilməsi, yeni təlim texnologiyalarına yiyələnmiş professor-müəllim heyətinin işə cəlb edilməsi, universitetdə tədrislə elmi fəaliyyətin vəhdətinə diqqət yetirilməsi, universitetin təhsil-tədqiqat-innovasiya mərkəzinə çevrilməsi, müasir infrastrukturun qurulması, idarəetmənin optimallaşdırılması, kitabxanaların, Dissertasiya Şurasının fəaliyyətinin gücləndirilməsi, dövri elmi nəşrlərin təkmilləşdirilməsi, ixtisasartırmanın keyfiyyətli təşkili, büdcə vəsaitindən və intellektual resurslardan səmərəli istifadə, diferensial əməkhaqqı, universitetə yüksək biliyə malik gənclərin cəlb edilməsi, təhsilin beynəlmiləşdirilməsi, universitetin beynəlxalq əlaqələri, yerli və beynəlxalq layihələrdə iştirak, tədris-təlim prosesində dəyişikliklərə nail olmağın yolları ilə bağlı görülən işlər, həmçinin ADPU-da humanist pedaqogika üzrə keçirilən konfrans barədə məlumat veriblər.

# ADPU-nun “Twinning” layihəsi üzrə akkreditasiyasının birinci mərhələsi başa çatdı

Xəbər verdiyimiz kimi, 11-13 apreldə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) “Twinning” layihəsi üzrə akkreditasiyasının birinci mərhələsi keçirilib. Xatırladaq ki, Azərbaycan ali təhsilinin Avropa ali təhsil məkanının tələblərinə daha da uyğunlaşdırılması layihəsi çərçivəsində ali təhsilin keyfiyyət təminatı üzrə Avropa Standartları və Təlimatlarına uyğun 3 ali təhsil müəssisəsi-Azərbaycan Dövlət Pedaqoji Universiteti, Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC) və Azərbaycan Texniki Universiteti (AzTU) pilot qiymətləndirmənin keçirilməsi üçün seçilib. Finlandiya və Estoniyadan olan təhsil ekspertləri, eləcə də müvafiq təlim keçmiş yerli ekspertlərdən ibarət qrup 3 gün müddətində ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, Elmi Şuranın və Dissertasiya Şurasının üzvləri, struktur bölmələrinin rəhbərləri, müəllim və tyutorları, məzunları, tələbələri, ADPU-nun baza məktəbi olan Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbin müəllimləri ilə görüşlər keçirərək sorğular aparıblar.

Aprelin 13-də ADPU-nun rektoru, professor Cəfər Cəfərovla



görüşən təhsil ekspertləri keçirdikləri görüşlər, apardıqları sorğular əsasında ADPU-nun “Twinning” layihəsi üzrə akkreditasiyasının birinci mərhələsi ilə bağlı rəy və təkliflərini universitet rəhbərliyinin diqqətinə çatdırıblar. Bildirilib ki, ADPU-nun Azərbaycanın ali təhsil sistemində xüsusi yeri və mövqeyi var. ADPU-nun rəhbərliyinin universitetin inkişaf strategiyası ilə bağlı qətiyyətli mövqeyi var və bu strategiyanı həyata keçirmək üçün ardıcıl və səmərəli fəaliyyət göstərir. Universitetin inzibati, pedaqoji və tələbə heyəti dəyişikliklərə hazırdır. Bununla yanaşı, təhsil ekspertləri görüşdə universitetin inkişaf strategiyasının prioritetlərə uyğun hazırlanması, qarşılıqlı etimad mühitinin yaradılması, təşkilati strukturun formalaşdırılması, idarəetmənin optimallaşdırılması, qəbul edilən qərarların dəqiq icra mexanizminə malik olması, tədris-təlim paradiqmasına ciddi yanaşılması, daxili keyfiyyət təminatı sisteminin yaradılması, tələbələrin pedaqoji təcrübələrinin tədris prosesinə inteqrasiyası, universitetin informasiya-kommunikasiya texnologiyaları (İKT) sahəsində imkanlarının genişləndirilməsi, professor-müəllim heyətinin və əməkdaşların İKT sahəsində bilik və bacarıqlarının təkmilləşdirilməsi, tələbə-gənclərin ingilis dilini, eləcə də digər xarici dilləri öyrənmələri üçün onların mobillik proqramlarında iştirakının təmin edilməsi, ingilis dilində dərslik, dərs vəsaitlərinin sayının çoxaldılması, doktoranturaya qəbul olan gənclərin elmi işlərinin keyfiyyətinə diqqətin artırılması, məzunların universitetin ümumi inkişaf prosesinə cəlb edilməsi və kampus (müasir tələbə şəhərciyi) yaradılmasının vacibliyi ilə bağlı fikir və təkliflərini irəli sürüblər. Qeyd edək ki, beynəlxalq ekspert qrupu iki ay müddətində yekun hesabat hazırlayıb Təhsil Nazirliyinə və ADPU-ya təqdim edəcək. Sonra birgə konfransın keçirilməsi və layihənin nəticələrin ictimaiyyətə açıqlanması nəzərdə tutulur.

Sonda təhsil ekspertləri onlara göstərilən səmimi münasibətə və yaradılan şəraitə görə universitetin rəhbərliyinə təşəkkür ediblər.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov təhsil ekspertlərinin rəy və təkliflərinin nəzərə alınacağını bildirərək onlara universitetin inkişafına verdikləri dəstəyə görə təşəkkür edib.

**Mənsur Qüdrətoğlu**

# Professor-müəllim heyətinin seçimi

Aprelin 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, professor Cəfər Cəfərov fakültə dekanları ilə görüşüb. Görüşdə ADPU-nun İnsan resursları şöbəsinin müdiri, hüquq elmləri namizədi Avtandil Bayramov, Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru, dosent Sənan Əliyev iştirak ediblər. Görüşdə ADPU-da kafedralarda tədris olunan fənlər üzrə professor, dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün keçiriləcək müsabiqənin birinci mərhələsi-sənəd qəbulu mərhələsinin nəticələri müzakirə edilib.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov görüşü giriş sözü ilə açaraq bildirib ki, bu müsabiqənin keçirilməsi Azərbaycanın ali təhsil sistemində mütərəqqi bir yenilik, pedaqoji kadrların seçilməsinə fərqli yanaşmadır. Müsabiqənin keçirilməsi barədə "Xalq qəzeti"nin, "Azərbaycan müəllimi"qəzetinin 4 mart 2017-ci il tarixli saylarında müvafiq elan dərc edilib, həmçinin universitetin portalında və sosial şəbəkələrdə məlumatlar paylaşılıb. Alternativ əsaslarla keçiriləcək müsabiqənin məqsədi ADPU-da şəffaf və obyektiv təhsil mühitinin yaradılması, dərin elmi biliyə, geniş dünyagörüşünə, zəngin erudisiyaya, yüksək mənəvi-əxlaqi keyfiyyətlərə malik rəqabətqabiliyyətli mütəxəssisləri işə cəlb etməkdir. Müsabiqəyə vəzifələr yox, fənlər çıxarılıb. Müsabiqəyə 114 vakant yer çıxarılıb. Müsabiqənin birinci mərhələsi-sənəd qəbulu mərhələsi aprelin 5-də başa çatıb. Sənəd qəbulu dövründə 114 vakant yerə 500 sənəd qəbul edilib. Müsabiqəyə ADPU-dan 350 nəfər, kənardan isə 150 nəfər sənəd verib. Sənəd verənlərin 230 nəfərinin elmi dərəcəsi var.

Səmərəli və işgüzar şəraitdə keçən görüşdə çıxış edən İnsan resursları şöbəsinin müdiri, hüquq elmləri namizədi Avtandil Bayramov fakültələr üzrə sənəd qəbulu barədə konkret rəqəmlər əsasında məlumat verib. Bildirib ki, İnsan resursları şöbəsi tərəfindən Filologiya fakültəsində 8 kafedra, 16 fənn, 21 yer üzrə 100 nəfərin sənədi qəbul edilib, onlardan 35-nin elmi dərəcəsi var. Riyaziyyat və informatika fakültəsində 4 kafedra, 8 fənn, 10 yer üzrə 44 nəfərin sənədi qəbul edilib, onlardan 23-nün elmi dərəcəsi var. Fizika və texnologiya fakültəsində 3 kafedra, 8 fənn, 9 yer üzrə 49 nəfərin sənədi qəbul edilib, onlardan 17-nin elmi dərəcəsi var. Kimya və biologiya fakültəsində 8 kafedra, 16 fənn, 20 yer üzrə 72 nəfərin sənədi qəbul edilib, onlardan 38-nin elmi dərəcəsi var. Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsində 3 kafedra, 12 fənn, 16 yer üzrə 77 nəfərin sənədi qəbul edilib, onlardan 22-nin elmi dərəcəsi var. Tarix və coğrafiya fakültəsində 7 kafedra, 11 fənn, 18 yer üzrə 83 nəfərin sənədi qəbul edilib, onlardan 45-nin elmi dərəcəsi var. İbtidai təhsil fakültəsində 2 kafedra, 5 fənn, 5 yer üzrə 24 nəfərin sənədi qəbul edilib, onlardan 10-nun elmi dərəcəsi var. Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində 4 kafedra, 11 fənn, 5 yer üzrə 51 nəfərin sənədi qəbul edilib, onlardan 13-nün elmi dərəcəsi var. "Psixologiyanın əsasları" və "Psixologiya" fənni üzrə 2 yerə 3 nəfərin sənədi qəbul edilib. A.Bayramov çıxışının sonunda sənəd verən şəxslərin müsabiqənin düzgün və qanun çərçivəsində keçiriləcəyinə inandıqlarını vurğulayıb.

Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru, dosent Sənan Əliyev çıxış edərək müsabiqənin keçirilmə qaydaları, şərtləri, fakültə dekanları və kafedra müdirləri, tədris-metodika şuralarının qarşısında dayanan vəzifələr barədə danışıb, müsabiqənin ədalətli və qanunauyğun keçirilməsi üçün fikir və təkliflərini irəli sürüb.

Görüşə yekun vuran rektor Cəfər Cəfərov fakültə dekanlarına müsabiqənin şəffaf və obyektiv keçirilməsi üçün öz tapşırıq və tövsiyələrini verərək qeyd edib ki, müsabiqənin şəffaf və obyektiv keçirilməsi universitetimizin nüfuzunun yüksəldilməsi işinin tərkib hissəsidir.

# Professor-müəllim heyətinin müsabiqəsinin ikinci mərhələsi

Xəbər verdiyimiz kimi, aprelin 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) kafedralarda tədris olunan fənlər üzrə professor, dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün keçiriləcək müsabiqənin birinci mərhələsi-sənəd qəbulu mərhələsi başa çatıb. Aprelin 20-də isə professor-müəllim heyətinin müsabiqəsinin ikinci mərhələsi başlayıb. Bu mərhələdə professor-müəllim heyətinin bilik, bacarıq və peşəkarlıq səviyyəsi müəyyən ediləcək. Alternativ əsaslarla keçiriləcək müsabiqənin məqsədi ADPU-da tədris prosesinin təkmilləşdirilməsi və daha səmərəli qurulması, şəffaf və obyektiv təhsil mühitinin yaradılması, sağlam rəqabətin formalaşdırılması, dərin elmi biliyə, kreativ düşüncəyə, zəngin erudisiyaya, ətraflı dünyagörüşünə, yüksək mənəvi-əxlaqi keyfiyyətlərə malik rəqabətqabiliyyətli mütəxəssisləri işə cəlb etməkdir. Xatırladaq ki, ADPU-da professor, dosent, baş müəllim və müəllim vəzifələrinin tutulması qaydaları öncədən universitetin rəsmi saytı olan adpu.edu.az saytında yerləşdirilib, həmçinin bu barədə sosial şəbəkələrdə geniş məlumatlar paylaşılıb. Bununla yanaşı, müsabiqənin keçirilməsi barədə "Xalq qəzeti"nin, "Azərbaycan müəllimi"qəzetinin 4 mart 2017-ci il tarixli saylarında müvafiq elanlar dərc edilib. Müsabiqəyə vəzifələr yox, fənlər çıxarılıb. Məlumat üçün bildirək ki, müsabiqəyə çıxarılan 114 vakant yerə



500 nəfər sənəd verib. Müsabiqəyə ADPU-dan 350 nəfər, kənardan isə 150 nəfər sənəd verib. Sənəd verənlərin 230 nəfərinin elmi dərəcəsi var. Universitetin Filologiya fakültəsində 8 kafedra, 16 fənn, 21 yer üzrə 100 nəfərin sənədi qəbul edilib, onlardan 35-nin elmi dərəcəsi var. Riyaziyyat və informatika fakültəsində 4 kafedra, 8 fənn, 10 yer üzrə 44 nəfərin sənədi qəbul edilib, onlardan 23-nün elmi dərəcəsi var. Fizika və texnologiya fakültəsində 3 kafedra, 8 fənn, 9 yer üzrə 49 nəfərin sənədi qəbul edilib, onlardan 17-nin elmi dərəcəsi var. Kimya və biologiya fakültəsində 8 kafedra, 16 fənn, 20 yer üzrə 72 nəfərin sənədi qəbul edilib, onlardan 38-nin elmi dərəcəsi var. Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsində 3 kafedra, 12 fənn, 16 yer üzrə 77 nəfərin sənədi qəbul edilib, onlardan 22-nin elmi dərəcəsi var. Tarix və coğrafiya fakültəsində 7 kafedra, 11 fənn, 18 yer üzrə 83 nəfərin sənədi qəbul edilib, onlardan 45-nin elmi dərəcəsi var. İbtidai təhsil fakültəsində 2 kafedra, 5 fənn, 5 yer üzrə 24 nəfərin sənədi qəbul edilib, onlardan 10-nun elmi dərəcəsi var. Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində 4 kafedra, 11 fənn, 5 yer üzrə 51 nəfərin sənədi qəbul edilib, onlardan 13-nün elmi dərəcəsi var. "Psixologiyanın əsasları" və "Psixologiya" fənni üzrə 2 yerə 3 nəfərin sənədi qəbul edilib. ADPU-nun rektoru, professor Cəfər Cəfərov müsabiqənin şəffaf və obyektiv keçirilməsinə ciddi nəzarət edir.

Qeyd edək ki, müsabiqənin keçirilmə qaydalarına və şərtlərinə uyğun olaraq ADPU-nun Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin ümumi nəzarəti ilə açıq dərslər keçirilir. Keçirilən açıq dərsləri fakültələrin tədris-metodika şuralarında alim-mütəxəssislər qiymətləndirir, sonra bu qiymətləndirmələr kafedralarda müzakirə olunur və müvafiq qərarlar qəbul edilir. Növbəti mərhələdə fakültə Elmi Şurası kafedraların qərarına münasibət bildirərək qalibləri müəyyən edir və Rektorluq qarşısında qalib gələn şəxslərlə müvafiq fənləri tədris etmələri üçün 5 tədris ili müddətinə əmək müqavilələsinin bağlanılması barədə vəsatət qaldırır. Əgər mübahisəli vəziyyət yaranarsa, rektor tərəfindən bu mübahisənin araşdırılması üçün komissiya yaradılır. Narazılıq öz təsdiqini taparsa, məsələ universitetin Elmi Şurasının müzakirəsinə çıxarılır və Elmi Şura son qərarı verir. Elmi Şuranın qərarı ilə qalib gələn şəxslərlə müvafiq fənləri tədris etmələri üçün 5 tədris ili müddətinə əmək müqaviləsi imzalanır. Müsabiqənin may ayının sonlarında başa çatdırılması nəzərdə tutulur.

# Həmkarlar İttifaqı Komitəsinin XVII hesabat-seçki konfransı

**Aprelin 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Həmkarlar İttifaqı Komitəsinin XVII hesabat-seçki konfransı keçirilib. Konfransda ADPU-nun rəhbərliyi, Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı (ATİAHİ) Respublika Komitəsi sədrinin müavini Mirzə Cəfərzadə, universitetin professor-müəllim heyəti, filialların direktorları iştirak ediblər. Konfransda əvvəlcə Azərbaycanın Dövlət Himni səsləndirilib.**




ADPU-nun Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev komitənin 2012-ci ilin aprel ayından 2017-ci ilin aprel ayına qədər gördüyü işlər haqqında hesabat məruzəsi ilə çıxış edib. Dosent V.Əliyev bildirib ki, vətəndaş cəmiyyətinin inkişafında, ictimai münasibətlərdə sivil, demokratik prinsiplərin əsas meyara çevrilməsində həmkarlar ittifaqlarının rolu müstəsnadır. Məlumdur ki, ümummilli liderimiz Heydər Əliyev həmkarlar ittifaqlarının öz missiyasını yerinə yetirməsinə lazimi şərait yaratmaqla bərabər, həmkarlar ittifaqlarının demokratik idarəçilik prinsiplərinə əsaslanan fəaliyyətinə həmişə dəstək vermişdir. 1994-cü ildə isə ulu öndər Heydər Əliyev "Həmkarlar İttifaqı haqqında" Qanun imzaladı. Bu Qanunda Həmkarlar İttifaqının fəaliyyətinə yüksək qiymət verilməklə bərabər, onların fəaliyyəti üçün müstəqil və heç bir dövlət qurumundan asılı olmayan şərait yaradıldı. Həmin Qanunun 5-ci bəndi buna parlaq misaldır. Belə ki, həmkarlar ittifaqları dövlət orqanlarından, müəssisələrdən, siyasi partiyalardan və ictimai birliklərdən asılı olmayıb, onlara hesabat vermirlər. Dövlət orqanlarının və vəzifəli şəxslərin həmkarlar ittifaqlarının hüquqlarının məhdudlaşdırılmasına səbəb olan və ya onların nizamnaməli çərçivəsində qanuni fəaliyyətinə maneçilik törədən hər cür müdaxiləsi qadağandır.

Həmkarlar ittifaqları müstəqil surətdə öz nizamnamələrini, fəaliyyət proqramlarını hazırlayır və təsdiq edir, strukturlarını müəyyənləşdirir, rəhbər orqanlarını seçir və geri çağırır, yığıncaqlar, konfranslar, plenumlar, məclislər, qurultaylar keçirir və Konstitusiya hüquqları əsasında fəaliyyət göstərirlər. Ümummilli Liderimizin sosial-iqtisadi siyasətini uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev ən kütləvi təşkilat olan həmkarlar ittifaqlarının cəmiyyətimizdə daha fəal mövqe tutmasına, normal fəaliyyət göstərməsinə və inkişafına xüsusi diqqət və qayğı göstərir. Son illər cənab Prezidentin diqqət və qayğısı sayəsində "Həmkarlar ittifaqları haqqında" Qanuna, Əmək Məcəlləsinə, İnzibati Xətalar Məcəlləsinə edilən dəyişikliklər buna sübutdur. Xüsusən Əmək Məcəlləsinin 80-ci maddəsinin yeni redaksiyada verilmiş I hissəsini fərqləndirmək lazımdır: "İşəgötürənlər tərəfindən həmkarlar ittifaqının üzvü olan işçinin əmək müqaviləsinə xitam verilməsi müəssisədə fəaliyyət göstərən həmkarlar ittifaqı təşkilatlarının qabaqcadan razılığı alınmaqla ləğv edilir". Bu, yalnız Azərbaycan həmkarlar ittifaqlarının cəmiyyətdəki nüfuzunun göstəricisi deyil, həm də bazar iqtisadiyyatı şəraitində həmkarlar ittifaqı üzvlərinin əmək hüquqlarının qorunması, işəgötürənlə işçilər arasında münasibətlərin tənzimlənməsi istiqamətində bizə verilən böyük səlahiyyətin göstəricisidir. İnzibati Xətalar Məcəlləsinə edilən dəyişiklik isə həmkarlar ittifaqlarının maddi vəziyyətlərinin möhkəmləndirilməsində mühüm rol oynayır. İnzibati Xətalar Məcəlləsinin 196-cı Maddəsini olduğu kimi nəzərinizə çatdırmaq istəyirəm: "Mülkiyyət formasından asılı olmayaraq, işəgötürən tərəfindən həmkarlar ittifaqının üzvü olan işçilərin əmək haqqından mühasibatlıq vasitəsi ilə həmkarlar ittifaqına üzvlük haqlarının tutulmasının təmin edilməməsinə və 4 iş günü müddətində həmin idarə, müəssisə və təşkilatın həmkarlar ittifaqı təşkilatının xüsusi hesabına köçürülməməsinə görə vəzifəli şəxslər min manatdan min beş yüz manatadək miqdarda cərimə edilirlər."

Həmkarlar İttifqı Təşkilatları ulu öndərimiz Heydər Əliyevin və onun layiqli davamçısı, ölkə Prezidenti cənab İlham Əliyevin apardığı məqsədyönlü daxili və xarici siyasətinə həmişə dəstək olmuşdur. Belə ki, AHİK 1998-ci ilin fevral ayında keçirdiyi qurultayında 1600000 üzvü adından ölkədə keçirilən prezident seçkilərində Heydər Əliyevin, 2003-cü ildə isə cənab İlham Əliyevin namizədliyini irəli sürmüş və onun namizədliyini dəstəkləmişdir.

Həmkarlar Təşkilatı öz işini 3 ildən bir Rektorluqla bağlanmış Kollektiv müqavilə əsasında qurur. Bu müqavilədə rektorluq və HİK-si öz üzərinə öhdəliklər götürür. Həmkarlar təşkilatının əsas vəzifələri Rektorluğun İttifaq üzvləri ilə əmək müqavilələsinin bağlanması, dəyişikliklər edilməsi və xitam verilməsinə, əmək haqlarının və xəstəlik vərəqələrinin vaxtı-vaxtında verilməsinə, ittifaq üzvlərinin qanunvericilikdə nəzərdə tutulmuş intizam qaydalarına əməl edilməsinə, dərs yüklərinin obyektiv bölünməsinə, kollektiv müqavilələrin müddəalarının Rektorluq tərəfindən yerinə yetirilməsinə, iş şəraitinin yaxşılaşdırılmasına, əgər maliyyə imkanı yaranarsa, işçilərin əmək haqlarının artırılmasına, vaxtında məzuniyyətə çıxarılmasına, istirahət günləri işə çıxan işçilərə əlavə istirahət günlərinin verilməsinə, yas və toy günlərində kollektiv müqavilədə nəzərdə tutulmuş əlavə məzuniyyətlərin verilməsi işindən ibarətdir.

ADPU-nun Həmkarlar İttifaqı Komitəsi 5 ildə xeyli işlər görmüşdür. Hesabat dövründə ittifaq üzvlərinin sayı 1380-2323 arasında dəyişmişdir.

(Davamı 4-cü səhifədə)

# Həmkarlar İttifaqı Komitəsinin XVII hesabat-seçki konfransı

(Əvvəli 3-cü səhifədə)

Hazırda HİK-si universitetdə 2323 (1439 nəfər ADPU, 885 nəfər filiallar) ittifaq üzvünü öz ətrafında birləşdirir. Hesabat dövründə HİK-si 25 nəfər Məclis üzvü, 11 nəfər Rəyasət heyətinin üzvü ilə işləmişdir. Bunlar 4 komissiyada birləşmişlər: 1.Təşkilati komissiya; 2.Mədəni-kütləvi və idman kossiyası; 3. Əməyin mühafizəsi komissiyası.; 4.Sosial müdafiə komissiyası.

5 ildə Rəyasət heyətinin 52, Məclisin 5 iclası keçirilmişdir. Rəyasət heyətinin 52 iclasında 116 məsələ, Məclisin 5 iclasında 5 məsələ müzakirə olunmuşdur. İclasda iş planı, ittifaq üzvlərinin sosial məsələləri, üzvlərin hüquqlarının qorunması, Rektorluq ilə HİK-si arasında bağlanmış kollektiv müqavilənin müddəaların yerinə yetirilməsi, ittifaq üzvlərinin yay istirahətinin təşkili, işçilərin texniki təhlükəsizlik şəraitində işləməsi, maddi yardım, intizam, bayram şənliklərinin hazırlığı və keçirilməsi, işçilərin tibbi müayinədən keçirilməsi, iş yerlərinin attestasiyası, imtahan sessiyalarına nəzarət və digər məsələlər müzakirə olunmuşdur. Belə ki, 2017-ci ilin fevral, mart aylarında ilk təşkilatlarda hesabat-seçki iclaslar keçirilmişdir. Seçkidən qabaq fakültə həmkarlar təşkilatı sədrləri ilə seminarlar, treninqlər keçirilmişdir. İlk təşkilatlarda hesabat-seçki yığıncaqları fəallıqla keçirilmişdir. Yığıncaqlarda 10 təşkilatda 74 nəfər çıxış etmiş, öz təkliflərini və tənqidi fikirlərini bildirmişlər. Fakültə Həmkarlar Təşkilatları öz fakültələrində tədris, intizam, mədəni-kütləvi, elmi tədbirlər və digər məsələlərin həllində yaxından iştirak etmişlər. Fakültə Həmkarlar təşkilatlarında keçirilən hesabat yığıncaqlarında aparılan struktur dəyişikliyindən, müəllimlərin yeni müsabiqəsindən, ixtisarlardan danışılmışdır. 2015-2017-ci illər üçün HİK-si ilə Rektorluq arasında kollektiv müqavilə imzalanmışdır. Hesabat dövründə 2 dəfə müqavilənin müddəalarının yerinə yetirilməsi ilə bağlı Rəyasət heyətində müzakirə keçirilmişdir. 2012-ci il aprel ayından - 2017-ci il aprel ayına kimi mədəni-kütləvi və idman tədbirləri üçün 146021 manat pul xərclənib. HİK-si hesabat dövründə bayram günlərində universitetin böyük akt zalında respublikanın görkəmli incəsənət ustalarının iştirakı ilə konsertlər təşkil etmiş, Yeni il, Novruz bayramı, Müstəqillik günü, Böyük Vətən müharibəsində Qələbənin ildönümü münasibətilə tədbirlər keçirmişdir. Kollektiv üçün M.F.Axundzadə adına Opera və Balet teatrında "Leyli və Məcnun" operasına, Xalq artisti Fidan Hacıyevanın iştirakı ilə "Karmen" operasına baxış keçirilmişdir. Azərbaycan Dövlət Akademik Milli Dram Teatrında C.Məmmədquluzadənin "Ölülər", "Ax Paris, Paris" və Dövlət Gənc Tamaşaçılar Teatrında tamaşalara baxış keçirilmişdir. Demək olar ki, universitetdə keçirilən bütün tədbirlərdə HİK-si yaxından iştirak edib və onların maliyyələşməsində köməklik edib.

5 il ərzində HİK-si yay aylarında universitet əməkdaşları və tələbələrindən 567 nəfəri üçün respublikanın gözəl guşələrindən sayılan Şamaxı, İsmayıllı, Quba, Altıağac və digər yerlərə gəzintilər təşkil etmişdir. ADPU-nun HİK-si idman sahəsində də bir çox işlər görmüşdür. Hər il ulu öndər Heydər Əliyevin anadan olamasının ildönümü münasibətilə universitetdə şahmat, dama, şaşki, voleybol, futzal növləri üzrə yarışlar keçirilir.

2012-ci ilin aprel ayından 2017-ci ilin aprel ayına kimi Rəyasət Heyətinin iclasında işçilərin təhlükəsizliyi, zərərli maddələrlə işləyən işçilərin sosial məsələləri ilə əlaqədar 6 məsələ müzakirə olunmuşdur. Komissiya universitetdə aparılan təmir işlərinə tez-tez baş çəkir, fəhlələrin təhlükəsizlik texnikası ilə tanış olmalarını, xüsusi geyimlə təmin olunmalarını, zərərli maddələrlə işləyən kimya, fizika fakültələrində laboratoriyaları yoxlamış, ortaya çıxan məsələləri yerindəcə həll etmişlər. Onların vaxtı-vaxtında tibbi komissiyadan keçirilmələrinə köməklik göstərmiş, əmək haqqlarının 16 % artırılmasını təmin etmişdir. Hazırda iş yerlərinin attestasiyası başa çatmış, sənədlər qaydasına salınır və yaxın vaxtlarda zərərli maddələrlə təmasda işləyən işçilərin əmək haqqlarına əlavə faizlərin verilməsi bərpa olunacaqdır. Bu, 111 işçini əhatə edəcəkdir. HİK-nin büdcəsi "Həmkarlar İttifaqı haqqında" Qanunun 24-cü maddəsinə uyğun Nizamnamə əsasında formalaşır. Nizamnamənin 10.3-cü bəndində deyilir ki, "Aylıq üzvlük haqqı aylıq əməkhaqqı, təqaüd və əlavə hesablanmış qazancların, maddi yardımın, mükafatın və digər gəlirlərin 2%-i miqdarında müəyyən olunur" . Yığılan üzvlük haqqının 30 %-i Nizamnaməyə əsasən Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin hesabına mühasibatlıqdan birbaşa köçürülür.Toplanmış ümumi üzvlük haqqının 20%-i isə istirahət mərkəzlərinin tikintisinə və saxlanılmasına mühasibatlıqdan yox, bizim hesabdan hər ay köçürülür. Qalan pullar əmək haqqlarının verilməsi, aparat işçilərinin mükafatlandırılması və onların sosial-məişət xərclərinə yönəldilir. Universitetin Həmkarlar İttifaqı Komitəsinin 4 ştatı sədr, baş məsləhətçi, baş mühasib və sürücüdən ibarətdir və 4 nəfər əlavə əməkhaqqı alırlar.



Qalan pullarin xərclənməsi aşağıdakı maddələr üzrə xərclənir:

**1. Maddi yardım 10%**
**2. Mədəni-kütləvi tədbirlər 30%**
**3. İttifaq üzvlərinin mükafatlandırılması 5%**
**4. İdman yarışlarına ayrılan xərclər 5%**
**5. Təsərrüfat xərci 3%**
**6. Ezamiyyə xərcləri 3%**

Yanvar ayında illik smeta tutulur. İldə 2 dəfə- iyun və dekabr ayının sonlarında Respublika Komitəsinə maliyyənin yerinə yetirilməsi ilə bağlı maliyyə hesabatı verilir. Yardım vermək üçün ittifaq üzvü ərizə ilə fakültə təşkilatına müraciət edir. Fakültə həmkarlar təşkilatı ərizəyə baxaraq qərar qəbul edib, universitet HİK-nə müraciət edir. Hər ayın sonunda Universitet Həmkarlar İttifaqı Komitəsi Rəyasət Heyətinin iclası keçirilir və iclasda ay ərzində universitet üzrə ittifaq üzvlərinin ərizələrinə baxılır və maliyyə imkanına görə məbləğ müəyyən edirik. Bu məbləğ Respublika Komitəsi tərəfindən bizə tövsiyə olunmuş şəkildə verilir. 30 manatdan başlayaraq 100 manata, nadir hallarda, əgər ittifaq üzvünün həyatında ağır hadisə baş veribsə və maliyyə imkanı buna imkan verirsə, minumum əməkhaqqının 2 misli qədər yardım edirik . Bu yaxınlarda "Dədə Qorqud elmi-tədqiqat laboratoriyası"nın elmi işçisinin evi yandığına görə biz 2 dəfə biz bu məbləği ona vermişik. Yardımlar ittifaq üzvlərinə ildə bir dəfədən çox olmayaraq verilir. Əgər hər hansı bir tədbir keçirilirsə, həmin tədbiri keçirmək üçün 3 nəfərdən ibarət təşkilat komissiyası yaradılır. Komissiya tədbirin keçirilməsi üçün iş planı və smeta tutur, ona əsasən maliyyə vəsaiti ayrılması barədə HİK-nin Rəyasət Heyəti səsvermə yolu ilə qərar qəbul edir. Tədbirdən sonra xərclənən pullar üçün aktlar və smetalar tutulur və xərclənməsi barədə Maliyyə Nazirliyi tərfindən qəbul olunmuş çeklər akta əlavə olunur. İdman yarışlarına xərclənən vəsait də həmin qayadada olur. Adətən, idman yarışlarının keçirilməsi üçün idman ləvazimatları, kuboklar, diplomlar, lazım gələrsə, qalib gələnlərə hədiyyələr və yaxud cədvəl üzrə pullar verilməsi nəzərdə tutulur. Mükafatlar, adətən, universitetin ictimai həyatında fəal iştirak etmiş, uzun müddət bu ali təhsil müəssisəsində səmərəli fəaliyyət göstərmiş insanlara, yubileyi olan əməkdaşlara verilir.

Təsərrüfat xərci isə ADPU-nun xidmətində olan avtomobillərin saxlanılmasına və digər xərclərə nəzərdə tutulub. Bu maddələr üzrə xərclənən pullar üçün də akt tərtib olunur, qərar verilir və maliyyə çekləri əlavə olunur.

Dosent V.Əliyev qeyd edib ki, univeristetdə uzun müddət səmərəli fəaliyyət göstərən müəllimlərimiz vardır. HİK olaraq belə insanların əməyinə qiymət vermək bizim əsas meyarımızdır. Belə ki, biz hesabat dövründə əməkdaşlardan 76 nəfərinin yubileylərini keçirmişik. Bu işdə bizə Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsi yaxından kömək edib. Hər bir yubileyi olan müəllimimizi ya kafedrasında, ya dekanlıqlarında, ya da HİK-nin Rəyasət Heyətinin iclaslarında təbrik etmişik. Onlara Azərbaycan Həmkarlar İttifaqları Konfedrasiyasının sədri, millət vəkili Səttar Mehbalıyevin imzaladığı fəxri fərman, pul mükafatı təqdim edilib, mətbu orqanımız olan "Təhsil" qəzetində onların həyatı, fəaliyyəti, təhsildə qazandıqları uğurlar barədə məqalə dərc etmişik. 76 nəfər ittifaq üzvünə 8400 manat pul xərclənmişdir. HİK-in hesabına bəzi üzvlərimizin yubileylərini keçirmişik. Biz dünyasını dəyişən əməkdaşlarımızın da ailə üzvlərinə yardımlar etmişik. Bunun üçün HİK-sinin büdcəsindən hesabat dövründə 5600 manat xərclənilib. 5 il ərzində HİK-ə 1104 nəfər maddi yardım almaqla əlaqədar ərizə ilə müraciət edib. Bütün ərizələr müsbət həll olunmuş, bunun üçün HİK-in büdcəsindən 77440 manat pul xərclənmişdir. Nabranda tikilən istirahət bazasına 5 il ərzində 108 min manat pul köçürülmüşdür. Biz həmçinin ittifaq üzvlərinin yay məzuniyyəti vaxtı istirahət və müalicə sanatoriyalarında istirahətinə xüsusi yer vermişik. 600-ə yaxın əməkdaş yollayış almaq üçün HİK-ə ərizə ilə müraciət etmişdir. Hesabat dövründə əməkdaşlardan 541 nəfərə, məbləği 478757 manat təşkil edən 376 ədəd yollayış verilmişdir. İstirahət zonalarına gedən əməkdaşların yollayışları 2,3,4 nəfərlik olmuşdur. Ali məktəblər arasında ən çox yollayış alan biz olmuşuq. Buna görə də TİAHİR Komitəsinə, onun sədrinə minnətdarlığımızı bildiririk. Respublika Komitəsi, şəxsən onun sədri, millət vəkili S.Mehbalıyev bizim universitetə həmişə hörmətlə yanaşmışdır. ADPU-nun 90 illik yubileyi münasibətilə 30 nəfər fəallarımıza fəxri fərman və pul mükafatları verilmişdir. 5 il ərzində 40 nəfər ittifaq üzvümüzə maddi vəziyyətlərinin ağır olduqlarını nəzərə alaraq yardımlar verilmişdir. Nazirlər Kabinetinin qərarına əsasən HİK-nin təqdimatı ilə ADPU-nun 26 nəfər əlil işçisinin əməkhaqqına II qrup əlillərin 20-25%, III qrup əlilləri isə 15-25% əlavələr edilmişdir. 77 nəfər İttifaq üzvünə "Əmək veteranı" kitabçası verilmişdir. Onlar ildə bir dəfə 21 gün müddətində Mərdəkanda pulsuz müalicə alıblar. İşçilərin hüquqlarının möhkəmləndirilməsi sahəsində bir çox işlər görülmüşdür. Yuxarıda qeyd etdiyim kimi, Rektorluq ilə Kollektiv müqavilə bağlanmışdır. Müqavilənin bütün bəndlərində İttifaq üzvlərinin hüquqlarının qorunması öz əksini tapmışdır. İşçilərin əməkhaqqının vaxtı-vaxtında verilməsi, onlara istirahət günlərində işə çıxdıqları üçün istirahət günlərinin verilməsi, toy və yas günlərində onlara əlavə istirahət günləri verilməsi, dərs saatlarının bölünməsində obyektivlik, vaxtında məzuniyyətə çıxılması və digər hüquqlar nəzərdə tutulub və rəhbərlik tərəfindən həyata keçirilir. HİK-si buna ciddi nəzarət edir. 5 il ərzində HİK-nə 621 nəfər müxtəlif məsələlərlə bağlı müraciət edib. Onların əksəriyyətinin şikayətlərinə aydınlıq gətirilib.

HİK-si bir daha bəyan edir ki, işçinin hüquqlarını yalnız qanunvericilik çərçivəsində müdafiə edir. İntizamı pozan işçilərə qarşı mübarizə aparılacaqdır. HİK-si hesabat dövründə 3 nəfər müəllimin əmək müqavilələrinə ƏM-nin 70-ci maddəsinin "c" bəndi ilə xitam verilməsinə razılıq vermişdir. Hesabat dövründə 7 nəfər işçinin əmək müqaviləsinə xitam verilməsinə etiraz etmişdir. Hesabat dövrü ərzində yeni struktur dəyişikliyi, ştat cədvəlindəki dəyişiklik və optimallaşma ilə əlaqədar 156 nəfər işçinin ixtisar olunması ilə əlaqədar əmək müqavilələrinə xitam verilməsinə razılıq verilməsi üçün HİK-ə Rektorluq tərəfindən təqdimat daxil olmuşdur. ADPU-da ixtisarlar labüd və qaçılmaz olmuşdur. Bir neçə gündən sonra 200 nəfərdən çox işçinin attestasiyaası keçiriləcəkdir. Artıq 9 nəfərdən ibarət komissiya fəaliyyət göstərir. Attestasiya komissiyası öz işini peşəkarlıq səviyyəsi yüksək olan işçilərin üzə çıxarılması məqsədləri üzərində qürüb. Öz işinin öhdəsindən gələ bilməyən, kompüter bacarıqları olmayan işçilərə qarşı komissiya qətiyyətli addımlar atacaq. Bundan başqa, universitetdə müəllimlərin müsabiqəsi keçirilir. 114 vakant yerə 500-ə yaxın müəllim sənəd təqdim etmişdir. Daha savadlı, bilikli müəllimlər işə cəlb ediləcəkdir.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov, ATİAHİ-nin Respublika Komitəsi sədrinin müavini Mirzə Cəfərzadə, İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov, kafedra müdirləri, professor Zahid Xəlil, professor Ələkbər Qurbanov,professor Ramiz Əliyev, professor İramin İsayev, dosent Rasim Abdurazaqov, dosent Gülçöhrə Alıyeva, Kitabxana-İnformasiya Mərkəzinin direktoru Azər Hüseynov, Həmkarlar İttifaqı Komitəsinin Təftiş Komissiyasının sədri Hüseyn Hacıyev, baş məsləhətçisi Nigar Rəhimova, ADPU-nun Şamaxı Filialının HİK-nin sədri Çingiz Dadaşov və başqaları hesabat məruzəsi ətrafında çıxış edərək komitənin fəaliyyətini yüksək qiymətləndiriblər və təşkilata uğurlar arzulayıblar.

Sonda səsvermə keçirilib. Dosent V.Əliyev ADPU-nun Həmkarlar İttifaqı Komitəsinin sədri seçilib.

## ADPU-nun Şamaxı Filialında ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş tədbir

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünün qeyd olunması ilə əlaqədar tədbirlər planı hazırlanmışdır. Həmin tədbirlər planına uyğun olaraq aprelin 27-də "Ulu öndər Heydər Əliyev azərbaycançılıq ideologiyasının, milli-mənəvi dəyərlərin qorunub saxlanılmasının və inkişafının təminatçısıdır" mövzusunda tədbir keçirildi. Tədbirdə əvvəlcə ulu öndər Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükutla yad edildi.

Tədbiri giriş sözü ilə açan filialın direktoru, filologiya üzrə fəlsəfə doktoru Tünzalə Yusifova qeyd etdi ki, ulu öndərimiz Heydər Əliyev bütün varlığı ilə doğma xalqına və Vətəninə bağlı olmuşdur. Ölkəmizin bütün sahələrində olduğu kimi, elm və təhsil sahəsində də davamlı inkişafının təməlini Heydər Əliyev qoymuşdur. Azərbaycan yaşadıqca Ulu Öndərin adı hər zaman onunla qoşa çəkiləcəkdir. Daim Heydər Əliyevin ideyalarına sadiq qalan Azərbaycan dövlətçiliyi dahi şəxsiyyətin siyasi kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin uğurlu siyasəti nəticəsində daha da güclənəcək.



Sonra ümummilli lider Heydər Əliyevin həyat və fəaliyyətini əks etdirən film nümayiş etdirildi.

Filialın Təbiət və pedaqoji elmlər kafedrasının baş müəllimi Çingiz Dadaşov "Heydər Əliyev - dövlətçilik, idarəçilik və vətəndaşlıq məktəbidir" adlı məruzəsində bildirdi ki, Heydər Əliyevin milli dövlətçilik konsepsiyasının əsasında azərbaycançılıq ideologiyası dayanır. Ümummilli Liderə görə, azərbaycançılıq müstəqil dövlət daxilində ümumxalq həmrəyliyini təmin edir.

Humanitar və xüsusi fənlər kafedrasının müəllimi Babək Abdullayev öz çıxışında Ümummilli Liderimizin təhsilə olan qayğısından danışdı.

"Tarix və coğrafiya müəllimliyi" ixtisasının III tədris ili tələbəsi Nərmin Maxsudova Heydər Əliyevin müstəqil Azərbaycan Respublikasına rəhbərlik etməyə başladığı gündən gənclərə xüsusi diqqət və qayğı ilə yanaşmasından danışaraq qeyd ki, biz müasir gənclər də öz növbəmizdə Heydər Əliyevin azərbaycançılıq ideologiyasına layiq olmağa çalışmalı və Vətənimizi hər zaman, hər sahədə uğurla təmsil etməliyik.

# "İslam həmrəyliyi elm və təhsildə: hədəflər və çağırışlar" Respublika elmi konfransı





Aprelin 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "İslam həmrəyliyi elm və təhsildə: hədəflər və çağırışlar" Respublika elmi konfransı keçirilib. Konfransda Təhsil Nazirliyinin məsul işçisi, dosent Afət Sadıqova, Azərbaycan Dillər Universitetinin (ADU) rektoru vəzifəsini icrə edən, professor Əfqan Abdullayev, Bakı Dövlət Universitetinin (BDU) Elmi işlər üzrə prorektoru, AMEA-nın müxbir üzvü, professor Aydın Kazımzadə, təhsil eksperti, Azərbaycan Respublikası Təhsil Şurasının sədri, professor Əjdər Ağayev, həmçinin ali təhsil müəssisələrinin və Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) tanınmış alim-mütəxəssisləri iştirak ediblər. Konfrans iştirakçıları əvvəlcə İslami dəyərləri əks etdirən kitab sərgisi ilə tanış olublar. Konfransda ilk olaraq Azərbaycanın Dövlət Himni səsləndirilib.

Konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev yanvarın 10-da "2017-ci ilin Azərbaycan Respublikasında "İslam Həmrəyliyi İli" elan edilməsi haqqında" Sərəncam imzalayıb. Bu Sərəncama uyğun olaraq ölkəmizdə müxtəlif tədbirlər həyata keçirilir. Bizim bu gün keçirdiyimiz "İslam həmrəyliyi elm və təhsildə: hədəflər və çağırışlar" Respublika elmi konfransı da bu Sərəncama əsasən keçirilən bir tədbirdir. Rektor qeyd edib ki, İslam dini humanist, dünyəvi, ümumbəşəri və demokratik dindir. İslam dini insanları əmin-amanlığa, sülhə, xeyirxahlığa, həmrəyliyə səsləyir. Çətin, mürəkkəb və gərgin olan müasir dövrümüzdə İslam ölkələrinin əlaqələrinin güclənməsinə və İslam dünyasının həmrəy olmasına böyük ehtiyac var. Təəssüflər olsun ki, bəzi xarici dairələrin məkrli siyasəti və İslam dünyasında mövcud olan məzhəb ayrı-seçkiliyi hazırda İslam ölkələrində qanlı toqquşmalara, müharibələrə, böyük faciələrə səbəb olur. Azərbaycan xalqı İslami dəyərlərə böyük qiymət verir. Əsası ulu öndərimiz Heydər Əliyev tərəfindən qoyulmuş sağlam dövlət-din münasibətləri yüksək səviyyədə inkişaf edir. Ölkə rəhbərliyinin müdrik və mütərəqqi siyasəti nəticəsində Azərbaycanda mövcud olan tolerantlıq və multikulturalizm bütün dünya üçün layiqli nümunədir. Azərbaycanın Birinci vitse-prezidenti, Heydər Əliyev Fondunun prezidenti Mehriban xanım Əliyeva İslam dininin nüfuzunun yüksəldilməsində böyük xidmətlər göstərmisdir. Tolerantlıq və multikulturalizm xalqımızın həyat tərzinə çevrilmişdir. Dinlə bağlı sərt qadağaların mövcud olduğu sovet dövrü Azərbaycanında cəmi 17 məscid fəaliyyət göstərdiyi halda, hazırda onların sayı 2000-i ötüb keçmişdir. Həmin məscidlərin 300-dən çoxu tarixi-mədəni abidə kimi qorunur. Azərbaycan İslam Əməkdaşlıq Təşkilatının, ISESCO-nun, həmçinin müsəlman ölkələrini birləşdirən digər mötəbər qurumların üzvü seçilərək İslam aləmi ilə qarşılıqlı faydalı münasibətlər qurmuş, qlobal əhəmiyyətli bir sıra mühüm mədəni forumların təşkilatçısı kimi çıxış etmişdir. Azərbaycanın İslam aləmində qazandığı nüfuz 2009-cu ildə Bakı və 2018-ci ildə Naxçıvan şəhərlərinin "İslam mədəniyyətinin paytaxtı" elan olunmasında öz ifadəsini tapmışdır. IV İslam Həmrəyliyi Oyunlarının 2017-ci ildə Bakı şəhərində keçirilməsi ilə bağlı qərar isə ölkəmizin İslam həmrəyliyinin möhkəmləndirilməsi sahəsində növbəti əməli addımlar atması üçün əlverişli şərait yaradır.

ADU-nun rektoru vəzifəsini icra edən, professor Əfqan Abdullayev, BDU-nun Elmi işlər üzrə prorektoru, AMEA-nın müxbir üzvü, professor Aydın Kazımzadə çıxış edərək konfransın aktual mövzuya həsr edildiyini bildirərək konfransın işinə uğurlar arzulayıblar.

Plenar iclasda professor Əjdər Ağayevin "İslami dəyərlər və şəxsiyyətin formalaşması", ADPU-nun Azərbaycan dilçiliyi kafedrasının müdiri, professor Nizami Xudiyevin "İslam həmrəyliyi birlik və əməkdaşlıq hərəkatı kimi", BDU-nun Türk xalqlarının tarixi kafedrasının professoru Nisbət Mehdiyevanın "XIX əsrdə Qazaxıstanda dini və dünyəvi təhsil" mövzularında məruzələri dinlənilib.

Plenar iclasdan sonra konfrans işini 4 elmi bölmədə: "İslam dövlətləri ilə Azərbaycanın elm və təhsil sahəsində əməkdaşlığı: reallıqlar, perspektivlər", "İslamda elm və təhsilin intellektual potensialın formalaşmasına təsiri", "İslam dünyası alimləri və elm", "İslami dəyərlər və təhsil" adlı bölmələrində davam etdirib. Bölmələr üzrə 65 məruzə dinlənilib. Sonda bölmə rəhbərlərinin hesabatı əsasında yekun qərar qəbul edilib və hər bölmə üzrə "Ən yaxşı məruzə" müəllifləri seçilib.

**Nigar Zülfüqarqızı**

# Tələbə Həmkarlar İttifaqı Komitəsinin XVII hesabat-seçki konfransı



Aprelin 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Həmkarlar İttifaqı Komitəsinin XVII hesabat-seçki konfransı keçirilib. Konfransda Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı (ATİAHİ) Respublika Komitəsi sədrinin müavini Mirzə Cəfərzadə, universitet tələbələri və filialların həmkarlar ittifaqı komitələrinin sədrləri iştirak ediblər. Konfransda əvvəlcə Azərbaycanın Dövlət Himni səsləndirilib.

ADPU-nun Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri, tarix üzrə fəsəfə doktoru Vurğun Məmmədov komitənin 2012-ci ilin aprel ayından 2017-ci ilin aprel ayına qədər olan fəaliyyəti haqqında hesabat məruzəsi ilə çıxış edib. V.Məmmədov bildirib ki, vətəndaş cəmiyyətinin inkişafında, ictimai münasibətlərdə sivil, demokratik prinsiplərin əsas meyara çevrilməsində tələbə həmkarlar ittifaqlarının rolu böyükdür. Ümummilli liderimiz Heydər Əliyev bütövlükdə həmkarlar ittifaqlarının öz vəzifələrini yerinə yetirmələrinə lazımi şərait yaratmaqla bərabər, həmkarlar ittifaqlarının demokratik idarəçilik prinsiplərinə əsaslanan fəaliyyətinə həmişə dəstək vermişdir. 1994-cü ildə ulu öndər Heydər Əliyev "Həmkarlar İttifaqı haqqında" Qanun imzaladı. Bu Qanunda həmkarlar ittifaqının fəaliyyətinə yüksək qiymət verilməklə bərabər, onların müstəqil fəaliyyət göstərmələri üçün şərait yaradıldı. Həmkarlar ittifaqları dövlət təşkilatlarından, müəssisələrdən, siyasi partiyalardan və ictimai birliklərdən asılı olmayaraq, müstəqil fəaliyyət göstərirlər. Dövlət təşkilatlarının və vəzifəli şəxslərin həmkarlar ittifaqlarının hüquqlarının məhdudlaşdırılmasına səbəb olan və ya onların nizamnamələri çərçivəsində qanuni fəaliyyətinə maneçilik törədən hər cür müdaxiləsi qanunla qadağan edilir.

V. Məmmədov qeyd edib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev həmkarlar ittifaqlarının fəaliyyətinə xüsusi diqqət və qayğı göstərir. Məhz bu qayğı və diqqət nəticəsində həmkarlar ittifaqları ölkəmizin ictimai-mədəni həyatında fəal iştirak edir, dövlətin və dövlətçiliyin gücləndirilməsinə xidmət edirlər. ADPU-nun Tələbə Həmkarlar İttifaqı Komitəsi də bu istiqamətdə əzmlə və səmərəli fəaliyyət göstərir.



Sonra ATİAHİ-nin Respublika Komitəsi sədrinin müavini Mirzə Cəfərzadə, həmçinin universitetin fəal tələbələri hesabat məruzəsi ətrafında çıxış edərək komitənin fəaliyyətini yüksək qiymətləndiriblər, öz fikir və təkliflərini söyləyərək təşkilata uğurlar arzulayıblar.

Sonda səsvermə keçirilib. V.Məmmədov ADPU-nun Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri seçilib.

**Könül Nəzərova**

# Ali məktəb tələbələrinin bədii yaradıcılıq festivalının baxış-müsabiqəsi

Mayın 10-da müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu, xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 94-cü ildönümü tamam olur. Ulu Öndərimizin anadan olmasının 94-cü ildönümü münasibətilə və Onun xatirəsinə ehtiram əlaməti olaraq respublikamızın ali, orta və ilk peşə-ixtisas təhsili müəssisələrinin tələbə və şagirdləri arasında bədii yaradıcılıq festivalı keçirilir. Bu bədii yaradıcılıq festivalı Təhsil Nazirliyi (TN) və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin (ATİAHİRK) birgə müvafiq qərarı əsasında keçirilir. Bədii yaradıcılıq festivalının keçirilməsində əsas məqsəd tələbə-gəncləri milli vətənpərvərlik, adət-ənənələrimizə, mədəniyyətimizə, incəsənətimizə hörmət ruhunda tərbiyə etmək, onların bədii-estetik səviyyəsini yüksəltmək, mədəni həyat tərzinin formalaşdırılması işinə kömək etmək, həmçinin incəsənət və mədəniyyətimizin ayrı-ayrı sahələri üzrə istedadlı gənclərin üzə çıxarılaraq onların qabiliyyətlərinin inkişaf etdirilməsinə dəstək verməkdir. Festivalın keçirilməsi üçün 5 nəfərdən ibarət Təşkilat Komitəsi və tərkibinə xalqımızın tanınmış incəsənət və mədəniyyət xadimlərinin daxil edildiyi 8 nəfərdən ibarət Münsiflər Heyəti yaradılmışdır.



Aprelin 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) universitetin tələbələrinin iştirakı ilə bədii yaradıcılıq festivalının baxış-müsabiqəsi keçirilib. ADPU-nun rektoru, professor Cəfər Cəfərov tələbələrin çıxışlarını dinləyib. Festivalın baxış-müsabiqəsində ADPU-nun tələbə-gənclərinin yüksək səviyyədə ifa etdikləri rəngarəng şeir və musiqi nömrələri diqqəti cəlb edib. Məlumat üçün bildirək ki, festival qaliblərinin yekun konsertinin may ayının birinci ongünlüyündə keçirilməsi nəzərdə tutulur. Qeyd edək ki, qaliblər Təhsil Nazirliyinin və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin diplom və hədiyyələri, mükafatları ilə təltif ediləcəklər.



**Könül Nərimanqızı**

# "Açıq qapı günü"

Aprelin 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) ümumi təhsil məktəblərinin yuxarı sinif şagirdləri üçün "Açıq qapı günləri" layihəsi çərçivəsində "Açıq qapı günü" keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, müəllimləri, ümumi təhsil məktəblərinin direktorları, müəllimləri, universitetin məzunları iştirak ediblər. Görüş iştirakçıları əvvəlcə universitetin fakültələrinin fəaliyyətini əks etdirən sərgi ilə tanış olublar. Tədbirdə əvvəlcə Azərbaycanın Dövlət Himni səsləndirilib.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq bildirib ki, "Açıq qapı günü"nü keçirməkdə məqsədimiz yuxarı sinif şagirdlərini universitetimizlə tanış etmək, bu ali təhsil müəssisəsində fəaliyyət göstərən fakültələr, ixtisaslar barədə məlumat verməkdir. Belə görüşlər gənclərin düzgün peşə və ixtisas seçmələri baxımından mühüm əhəmiyyət kəsb edir.

ADPU-nun tarixi və fəaliyyəti haqqında məlumat verən rektor bildirib ki, universitet 1921-ci il avqustun 26-da Azərbaycan Xalq Komissarları Sovetinin sədri Nəriman Nərimanovun imzaladığı dekretlə yaradılıb. Fəaliyyət göstərdiyi müddət ərzində ADPU ölkəmizdə elm və təhsilin inkişafına böyük töhfələr verib, yüksəkixtisaslı pedaqoji və elmi-pedaqoji kadrların hazırlanmasında mühüm xidmətlər göstərib. Hazırda ADPU-da 8 fakültə-Filologiya, Tarix və coğrafiya, Riyaziyyat və informatika, Kimya və biologiya, Fizika və texnologiya, Məktəbəqədər təhsil, Psixoloji xidmət və korreksiyaedici təlim, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq, İbtidai təhsil fakültələri, 39 kafedra, Magistratura və doktorantura şöbəsi, Davamlı təhsil və təlim şöbəsi, həmçinin SABAH qrupları fəaliyyət göstərir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli Sərəncamı ilə təsdiq olunmuş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda nəzərdə tutulan ən mühüm vəzifələrdən biri də müasir tələblərə cavab verən təhsil infrastrukturunun yaradılması və təhsil müəssisələri şəbəkəsinin rasionallaşdırılmasıdır. Dövlət Strategiyasının bu tələblərinə uyğun olaraq, ölkə Prezidentinin 26 noyabr 2015-ci il tarixli Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutunun (AMİ) ADPU-ya birləşməsi və onun filiallarının ADPU-nun strukturuna çevrilməsi nəticəsində ADPU ölkədə pedaqoji kadr hazırlığı ilə məşğul olan unikal ixtisaslaşmış ali təhsil müəssisəsinə çevrilmişdir. Bununla yanaşı, Nazirlər Kabinetinin 3 fevral 2016-cı il tarixli qərarı ilə Bakı Sənaye-Pedaqoji Kolleci Azərbaycan Dövlət Pedaqoji Kollecinə (ADPK) birləşdirilməklə ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci kimi fəaliyyət göstərməyə başlayıb. Hazırda ADPU-nun 5 filialı-Ağcabədi, Cəlilabad, Quba, Şəki və Şamaxı filialları fəaliyyət göstərir.



Bunlarla yanaşı, Təhsil naziri cənab Mikayıl Cabbarovun 20 iyul 2016-cı il tarixli əmri ilə Bakı şəhərindəki Məmməd Rahim adına 7 nömrəli tam orta məktəb 2016-2017-ci tədris ilindən ADPU-nun baza məktəbi kimi müəyyənləşib. ADPU-da hazırda filiallar və Pedaqoji Kolleclə birlikdə təxminən 20 minə yaxın tələbə təhsil alır. ADPU-da ali təhsilin bakalavriat səviyyəsində 22 ixtisas, magistratura səviyyəsində isə 19 ixtisas, 20 ixtisaslaşma üzrə pedaqoji kadr hazırlanır. Universitetin 1 professoru AMEA-nın müxbir üzvü, 4 professoru isə Əməkdar elm xadimidir.

Cari ildə 500 və 500-dən yuxarı bal toplayıb müəllimlik ixtisasını seçənlərin sayı 117 nəfərdir. Builki tədris ilində yüksək bal toplayaraq ADPU-ya dövlət sifarişi əsasında qəbul olunmuş tələbələr ümumilikdə universitetə qəbul olunmuş tələbələrin təxminən 80 faizini təşkil edib. Dövlət İmtahan Mərkəzinin verdiyi məlumata görə, 2016-2017-ci tədris ilində ADPU-ya ali təhsilin bakalavriat pilləsində qəbulolunma faizi 97,18 faiz olmuşdur. Magistratura səviyyəsində qəbulolunma faizi isə 92,42 faiz olmuşdur. Bu göstəricilərə görə ADPU universitetlər arasında III yeri tutub. Bu il həm



ali təhsilin bakalavriat səviyyəsində, həm də magistratura səviyyəsində göstəricilər əvvəlki illərlə müqayisədə uğurlu olmuşdur.

Bu gün respublikamızda müəllim hazırlığına xüsusi diqqət yetirilir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev yüksək hazırlıqlı peşəkar pedaqoji kadrların hazırlanmasını vacib bir vəzifə kimi bizim qarşımıza qoyub. Təhsil Nazirliyi cəmiyyətdə müəllim peşəsinin nüfuzunun yüksəldilməsi, pedaqoji fəaliyyətinin stimullaşdırılması üçün davamlı və səmərəli fəaliyyət göstərir. Təhsil Nazirliyi tərəfindən 2014-2015-ci tədris ilində "Gələcəyin müəllimi təqaüdü" təsis edilib. Bu təqaüd pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və 500-dən yuxarı bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən tələbələrə şamil olunur. Onlara əlavə 100 manat təqaüd verilir. Builki tədris ilində 500 və 500-dən yuxarı bal toplayıb ADPU-nu seçənlərin sayı 117 nəfərdir. Müqayisə üçün qeyd edək ki, 2014-2015-ci tədris ilində bu rəqəm 18 olub. Bunun səbəbi ölkəmizdə müəllim peşəsinə maraqın artması ilə izah edilir.

Hazırda ADPU-da ümumi təhsil məktəbləri ilə əlaqələrin genişləndirilməsinə xüsusi diqqət yetirilir. ADPU-da "Ustad dərsləri" layihəsi həyata keçirilir. "Ustad dərslər" layihəsində ümumi təhsil məktəblərində çalışan, iş təcrübəsi və tədris nəticələri ilə fərqlənən müəllimlərin tədris etdikləri fənlər üzrə universitetimizdə uyğun fənnin tədrisi metodikasından ustad dərsləri aparmaları nəzərdə tutulur. Layihəyə qabaqcıl təcrübəsi, yaradıcı fəaliyyəti, innovativ düşüncə tərzi ilə ölkə pedaqoji mühitində tanınan, ümumi təhsil orta məktəb müəllimlərinin mövcud bazasında adları yer alan, əməkdar müəllimlər, 2008-2015-ci illərdə keçirilmiş "Ən yaxşı müəllim" müsabiqəsinin qalibləri, orta məktəb müəllimlərinin diaqnostik qiymətləndirməsi zamanı yüksək nəticələr əldə edən, müxtəlif təltiflərə layiq görülən, həmçinin "2007-2015-ci illərdə Azərbaycan gənclərinin xaricdə təhsil üzrə Dövlət Proqramı" üzrə təhsil almış müəllimlər cəlb ediliblər. Bu layihə çərçivəsində paytaxtın tanınmış məktəblərinin qabaqcıl müəllimləri yeni təlim metodları əsasında ADPU-da ustad dərsləri keçirlər.

Martın 10-da ADPU-da 50 ümumi təhsil məktəbinin direktorları ilə görüş keçirilib, əməkdaşlıq əlaqələrinin genişləndirilməsi üçün səmərəli fikir mübadiləsi aparılıb. Martın 29-da isə ADPU-nun və Azərbaycan Respublikasının Təhsil İnstitutunun birgə təşkilatçılığı ilə universitetdə "Pedaqoji təhsil: Universitet və məktəb əlaqələri" mövzusunda dəyirmi masa keçirilib. Bunlarla yanaşı, fakültələrdə "Açıq qapı günləri" keçirilib. Lakin biz bu görüşləri, dəyirmi masaları və digər tədbirləri keçirməklə öz işimizi bitmiş hesab etmirik. Biz orta məktəblərlə əlaqələrin daha da genişləndirilməsini və bu əlaqələrin keyfiyyətinin yüksəldilməsini vacib bir vəzifə kimi qarşımıza qoymuşuq.

Tədbirdə çıxış edən ADPU-nun məzunları, Təhsil Şurasının sədri, Əməkdar müəllim, professor Əjdər Ağayev və BDU-nun kafedra müdiri, professor Yaqub Qəribli müəllimliyin şərəfli, müqəddəs, eyni zamanda məsuliyyətli peşə olduğunu bildirərək şagirdlərə müəllimlik peşəsini seçməyi tövsiyə ediblər.

Görüşdə şagird və müəllimlərin sualları cavablandırılıb.

Tədbirdə ADPU-nun fəaliyyətini əks etdirən slaydlar təqdim edilib. Sonra şagird və müəllimlərin fakültə və kafedralarda professor-müəllim heyəti və məzunlarla görüşü keçirilib. Tədbir universitet tələbələrinin hazırladıqları bədii-musiqili hissə ilə başa çatıb.

**Mahirə Məhərrəmqızı**

# "Mənəvi-əxlaqi dəyərlərin təhsilə tətbiqi" mövzusunda beynəlxalq təlimlər

Aprelin 17-18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU), ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin (ADPK) və Respublika Humanist Pedaqogika Mərkəzinin birgə təşkilatçılığı ilə universitetdə Tailand Texnoloji Elmi-Tədqiqat İnstitutunun direktoru, NASA-nın əməkdaşı, peşəkar pedaqoq, professor Art Onq Djumsai "Mənəvi-əxlaqi dəyərlərin təhsilə tətbiqi" mövzusunda ikigünlük beynəlxalq təlimlər keçirib. Beynəlxalq təlimlərdə ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti, Milli Məclisin Elm və təhsil komitəsinin sədr müavini, AMEA-nın müxbir üzvü, professor Bəxtiyar Əliyev, ADPK-nin rəhbərliyi və müəllimləri, filiallarının direktorları və müəllimləri, ümumi təhsil məktəblərinin direktorları və mütəxəssisləri, təhsil ekspertləri, Əməkdar elm xadimi, professor Şahlar Əsgərov, fəlsəfə doktoru Etibar Əliyev, Sankt-Peterburqdakı Ümuminsan Dəyərləri İnstitutunun filial direktoru Valeriy Voşinin iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov qonaqları və iştirakçıları salamlayaraq bildirib ki, bu gün ADPU-nun həyatında xoş və əlamətdar bir gündür. Azərbaycan dəyişir, yeniləşir, müasirləşir. Bu yenilik və və müasirliyə uyğun olaraq ADPU-da da təhsilin məzmununun yenilənməsi və tədrisin keyfiyyətinin yüksəldilməsi, professor-müəllim heyətinin seçiminin başlanılması, idarəetmənin optimallaşdırılması, müasir idarəetmə infrastrukturun yaradılması üçün islahatlar həyata keçirilir. Hazırda bizim fəaliyyətimizin əsas istiqamətlərindən biri qabaqcıl beynəlxalq təcrübənin öyrənilib tətbiq edilməsidir. Bu baxımdan məşhur pedaqoq, professor Art Onq Djumsainin universitetimizdə keçirdiyi təlimlər mühüm əhəmiyyət kəsb edir. Bu təlimlər ölkə pedaqoqlarının mənəvi-əxlaqi zəmində inkişafına və ümumbəşəri dəyərlərin təhsilə inteqrasiyasına yeni implus verəcək.



Rektor professor Art Onq Djumsainin fəaliyyəti barədə məlumat verərək bildirib ki, o, dünya səviyyəli alim, ixtiraçı, pedaqoqdur. Bir çox nüfuzlu beynəlxalq mükafatlara layiq görülüb. Üç dəfə parlament üzvü seçilib. Ümumbəşəri dəyərlərin təhsilin məzmununa tətbiqi sahəsində 250 mindən çox pedaqoji kadrın hazırlığına rəhbərlik edib. O, ümumbəşəri dəyərlərin təhsilə, məktəbə inteqrasiya olunmasını təbliğ edir və bu istiqamətdə səmərəli fəaliyyət göstərir. Alim bütün dünyada tanınan Satya Sai məktəbini yaradıb. Çıxışının sonunda rektor Cəfər Cəfərov təlimlərin keçirilməsinə görə cənab Art Onq Djumsaiyə və təlimin təşkilatçılarına təşəkkür edib.




Professor Art Onq Djumsai slayd vasitəsilə çıxış edərək real həyat hadisələri və konkret faktlar əsasında, eləcə də öz təcrübəsi əsasında ümumbəşəri dəyərlərin təhsilə inteqrasiyası, rəhbərlik etdiyi məktəbin şagirdlərinin mənəvi-əxlaqi keyfiyyətlərinin inkişafına yönəldilmiş fəaliyyəti barədə məlumat verib. Alim qeyd edib ki, müasir təhsil bilik verir, lakin biz bütün insanlara dünyada yaşamağa imkan verən təhsilə ehtiyac duyuruq. Buna görə uşağın xarakterinin formalaşması başlıca şərtdir. Alimin fikrincə, səbirli və tam səmimi olan, uşağı ürəkdən sevən, fədakar müəllim onun xarakterinin formalaşmasında böyük rol oynayır. Albert Eynşteyinin dediyi kimi, "İntuitsiya əvvəlcədən düşünülən niyyət və yaxud hərəkət planı deyil. İntuitsiya ürəkdən gəlir". Öz məktəbinin alternativ enerji mənbələrindən istifadə edilməsi sahəsində qazandığı nailiyyətlərdən danışan Art Onq Djumsai qeyd edib ki, məktəbin fəaliyyət prinsipləri "Gələcəyin enerjisi" şüarı ilə keçiriləcək "EKSPO-2017" sərgisinin fəlsəfəsinə uyğundur və dünya ictimaiyyəti üçün aktual olan alternativ enerji mənbəyi mövzusunu işıqlandıracaqdır. Humanist alim təlim iştirakçılarını ümumi dünyamızın sülh, əmin-amanlıq şəraitində yaşaması, inkişafı və xoşbəxtliyi naminə həmrəy olmağa, birgə fəaliyyət göstərməyə çağırıb.



Sankt-Peterburqdakı Ümuminsan Dəyərləri İnstitutunun filial direktoru Valeriy Voşinin çıxış edərək beynəlxalq təlimin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib.

Beynəlxalq təlimlər zamanı iştirakçıların çoxsaylı sualları cavablandırılıb, maraqlı fikir mübadiləsi aparılıb. Sonda xatirə şəkli çəkdirilib.

# Tədris-yardımçı heyətin bilik və peşəkarlıq səviyyəsi yoxlanılır

Məlum olduğu kimi, aprelin 20-dən başlayaraq Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) kafedralarda təd-




ris olunan fənlər üzrə professor, dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün keçirilən müsabiqənin ikinci mərhələsi başlayıb. Alternativ əsaslarla keçiriləcək müsabiqənin məqsədi ADPU-da tədris prosesinin təkmilləşdirilməsi və daha səmərəli qurulması, şəffaf və obyektiv təhsil mühitinin yaradılması, sağlam rəqabətin formalaşdırılması, dərin elmi biliyə, kreativ düşüncəyə, zəngin erudisiyaya, ətraflı dünyagörüşünə, yüksək mənəvi-əxlaqi keyfiyyətlərə malik rəqabətqabiliyyətli mütəxəssisləri işə cəlb etməkdir. Eyni zamanda ADPU-da tədris-yardımçı heyətin də bilik və peşəkarlıq səviyyəsinə ciddi diqqət yetirilir. Belə ki, ADPU-nun rektoru, professor Cəfər Cəfərovun müvafiq əmri ilə İnsan resursları şöbəsi tərəfindən aprelin 25-dən universitetdə tədris-yardımçı heyətin: tədris laboratoriya müdirlərinin, tyutorların, laborantların, baş laborantların, tədris ustalarının, operatorların və Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşlarının bilik və peşəkarlıq səviyyəsinin yoxlanılmasına başlanılıb. Məqsəd onların peşəkarlıq səviyyəsinin müəyyən edilməsi və təhsilin keyfiyyətinin yüksəldilməsidir. ADPU-nun rektoru, professor Cəfər Cəfərov yoxlamanın şəffaf və obyektiv keçirilməsinə ciddi nəzarət edir. Yoxlamaya ümumilikdə 247 nəfər cəlb edilib. Yoxlama iki mərhələdə aparılacaq. Yoxlamanın birinci mərhələsində hər bir qrupu 14 nəfərdən ibarət olan tədris-yardımçı heyətin informasiya-kommunikasiya texnologiyaları (İKT) sahəsində bilik və bacarıqları yoxlanılacaq. Növbəti həftə keçiriləcək ikinci mərhələdə isə onların elmi-nəzəri bilik səviyyələri, qanunvericiliklə bağlı bilikləri, məntiqləri, dünyagörüşləri yoxlanılacaq. Yoxlamaların nəticələrindən asılı olaraq hər bir işçi barədə fərdi qaydada müvafiq qərar qəbul ediləcək.

# Fizika və texnologiya fakültəsində Aprel hadisələrinin ildönümünə həsr olunmuş tədbir

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsində Aprel hadisələrinin ildönümünə həsr olunmuş tədbir keçirilmişdir. Tədbir Azər-





baycanın Dövlət Himninin səsləndirilməsi ilə başlamışdır. Tədbiri giriş sözü ilə fakültənin dekanı, fizika üzrə fəlsəfə doktoru Arzu Daşdəmirov açmışdır. O, çıxışında qeyd etmişdir ki, 2-5 aprel 2016-cı ildə Azərbaycan Ordusu erməni hərbi qüvvələrinin müdafiə xəttini yarıb, bir neçə strateji yüksəklik və yaşayış məntəqəsi üzərində nəzarəti ələ keçirmişdir. Qeyd edək ki, bu, atəşkəs elan olunandan 22 il sonra ilk dəfə baş vermiş ən böyük döyüşdür və ordumuzun zəfəri ilə nəticələnmişdir. Sonra ADPU-nun Tələbə Həmkarlar İttifaqı Komitəsinin (THİK) sədri, tarix üzrə fəlsəfə doktoru Vurğun Məmmədov Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin tarixi və səbəbləri haqqında danışmışdır. Fakültənin I kurs tələbəsi Aysel Əhmədova Aprel döyüşləri haqqında qısa məlumat vermişdir. Sonra tədbirdə Çingiz Mustafayevin “Şəhid arzuları” mahnısı ifa olunmuşdur. Fakültənin I kurs tələbəsi Aytaş Əliyeva “Şəhid anası” şeirini söyləmiş, aprel döyüşlərində həlak olan şəhidlərin həyatı haqqında məlumat verilmişdir. Tədbirdə Aprel döyüşləri haqqında videoçarx göstərilmiş və fakültə Tələbə Həmkarlar Təşkilatının sədri Nərmin Babayeva Aprel döyüşləri haqqında öz fikirlərini bölüşmüşdür.

Sonda fakültənin dekanı A.Daşdəmirov tədbiri yekunlaşdıraraq tədbirin ərsəyə gəlməsində rolu olan tələbələrə öz təşəkkürünü bildirmişdir.

# Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsində elmi-praktik seminar

Aprelin 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə Aprel döyüşlərinin ildönümü ilə bağlı



“Azərbaycan Respublikası Silahlı Qüvvələri ölkənin suverenliyi və ərazi bütövlüyünün təminatçısı, hər bir vətəndaşın qürur yeridir” mövzusunda elmi-praktik seminar keçirilib. Seminarda fakültənin müəllim və tələbələri, hərbçilər iştirak ediblər. Tədbirin əvvəlində Aprel döyüşlərində həlak olmuş əsgər və zabitlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Seminarı giriş sözü ilə açan fakültənin dekanı, dosent Laçın Həsənova bildirib ki, 2-5 aprel 2016-cı ildə baş verən hadisələrdən bir il ötür. Azərbaycan Respublikasının Prezidenti, Silahlı Qüvvələrin Ali Baş Komandanı cənab İlham Əliyevin rəhbərliyi altında həyata keçirilən Aprel döyüşləri Azərbaycan Ordusunun böyük qələbəsidir. Bu qələbə ermənilərin “məğlubedilməzliyi mifi”ni dağıtdı və Dağlıq Qarabağda mövcud status-kvonun dəyişilməsinin vacibliyini bir daha ortaya qoydu.

Tədbirdə Müdafiə Nazirliyinin əməkdaşı, polkovnik Məhərrəm Cahangirov, Aprel döyüşlərinin iştirakçıları, polkovnik-leytenant Vüqar Mirzəliyev, polkovnik-leytenant Eldəniz Sadıqov, ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, fakültənin baş müəllimi, kapitan Natiq Əliyev, III tədris ilinin tələbəsi Azər Əliyev çıxış ediblər. Çıxışlarda qeyd edilib ki, ötən il aprelin 1-dən 2-nə keçən gecə erməni silahlı bölmələri tərəfindən bütün cəbhə boyu mövqelərimiz iriçaplı silahlar, minaatanlar, qumbaraatan və artilleriya qurğularından davamlı atəşə tutulub. Eyni vaxtda qoşunların təmas xəttinə yaxın mülki əhalinin sıx yaşadığı bir sıra yaşayış məntəqələri də düşmənin atəşinə məruz qalıb. Qarşı tərəfin hərbi fəallığının genişləndirməyə imkan verməmək, onun fəaliyyətinin qarşısını almaq məqsədilə Azərbaycan Silahlı Qüvvələri tərəfindən əməliyyat şəraiti qiymətləndirilərək dərhal cavab tədbirlərinin görülməsi üçün qərar verilib.

Aprelin 2-dən 5-dək davam edən döyüşlər zamanı Goranboy rayonu və Naftalan şəhərinə təhlükə yarada biləcək Talış kəndi ətrafındakı yüksəkliklər düşmən qüvvələrindən tam təmizlənib. Horadiz şəhərinin düşmən təhlükəsindən qorunması məqsədilə Füzuli rayonu istiqamətində yerləşən, geniş ərazini nəzarətdə saxlamaq imkanı verən strateji əhəmiyyətli “Lələtəpə” yüksəkliyi də bölmələrimizin nəzarətinə keçib. Ermənistan Silahlı Qüvvələrinin işğal olunmuş ərazilərimizdə fəaliyyət göstərən komanda-qərargah məntəqəsi qoşunlarımızın endirdiyi dəqiq cavab atəşi ilə darmadağın edilib, nəticədə düşmənin yüksək rütbəli zabitləri-polkovnik və generallar məhv edilib. 4 günlük döyüşlərdə Azərbaycan Ordusu 2000 hektar ərazisini işğaldan azad edib. İşğaldan azad edilən strateji yüksəkliklərdən Dağlıq Qarabağ ərazisinin xeyli hissəsinə nəzarət etmək mümkündür. Düşmən tərəfindən 300 nəfərdən çox ölüb, 500 nəfərdən çox isə yaralanıb. Döyüşlərdə Azərbaycan Ordusu da itki verib, çoxlu şəhidlərimiz olub. Qədirbilən xalqımız bütün şəhidlərimizin, o cümlədən Aprel şəhidlərinin xatirəsini əziz tutur. Çıxışlarda gənclərin hərbi-vətənpərvərlik tərbiyəsinin gücləndirilməsinin vacibliyi ifadə edilib.



Şəhid polkovnik-leytenant Sənan Axundovun həyat yoldaşı, fakültənin baş müəllimi Nəcibə Axundova çıxış edərək tədbirin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib, həyat yoldaşının döyüş yolundan danışıb, onunla bağlı xatirələrini bölüşüb, ailələrinə göstərilən dövlət qayğısından razılıq edib.

Tədbir fakültənin müəllim və tələbələrinin hazırladıqları konsert proqramı ilə davam edib. Vətənpərvərlik ruhunda səslənən və qələbəyə inamı ifadə edən musiqilər tədbir iştirakçılarında yüksək əhvali-ruhiyyə yaradıb.

**Nigar Abbasova**

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində “Tələbəliyin son günü” adlı tədbir

Aprelin 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində IV tədris ili tələbələri üçün “Tələbəliyin son günü” adlı tədbir keçirilib. Qeyd edək ki, bu tədbir ənənəvi olaraq dörd ildir ki, fakültədə böyük ruh yüksəkliyi ilə keçirilir. Tədbirdə ADPU-nun



Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, Ümumi işlər üzrə prorektoru Əbdül Xalıqov, Tələbə Gənclər Təşkilatının (TGT) sədri Cavid Hüseynov, fakültənin professor-müəllim heyəti və valideynlər iştirak ediblər. Tədbirdə fakültədə tədris olunan hər 3 ixtisasdan 11 buraxılış qrupu iştirak edib. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib. Giriş sözü ilə çıxış edən fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva IV tədris ili tələbələrini universiteti bitirmələri münasibətilə təbrik edərək onlara uğurlar arzulayıb. Dekan Ş.Əliyeva Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin gənclərə göstərdiyi xüsusi diqqət və qayğıdan danışıb. O, həmçinin ADPU-nun rektoru, professor Cəfər Cəfərovun universitetdə tələbələrin daha yaxşı təhsil ala bilmələri üçün həyata keçirdiyi tədbirləri qeyd edib.

Tərbiyə işləri üzrə prorektor, professor Fikrət Rzayev çıxış edərək tələbələri təbrik edib, onlara ən xoş, ən səmimi arzularını bildirib. Sonra səhnəyə fakültə tələbələrinin rəqs qrupu çıxıb. Gözəl rəqslərdən sonra tələbələrin hazırladıqları musiqi nömrələri səslənib. Zərif Sadıqovanın, Ərcan Yılmazın və Mehin Soltanovanın ifa etdikləri mahnılar tədbirə xüsusi rəng qatıb.



Tədbirdə tələbələr dekana, kafedra müdirlərinə, tyutorlara, qrup nümayəndələrinə və fərqlənən tələbələrə sertifikat və təşəkkürnamələr təqdim ediblər. Tələbələrin “Vals” rəqsi hamının marağına səbəb olub. Onların rəqsləri, mahnıları hamını məmnun edib. Tədbirdə üzərinə fakültənin adı yazılmış böyük tort kəsilib. Atəşfəşanlıq tədbiri daha əyləncəli və maraqlı edib. Tədbir tələbə-gənclərin rəqsləri ilə davam edib. Sonda tələbələr tədbirin maraqlı və rəngarəng keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə, fakültənin müəllimlərinə və valideynlərə təşəkkür ediblər.

# İbtidai təhsil fakültəsinin əməkdaşları Akif Abdullayev adına 211 nömrəli tam orta məktəbdə

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsinin professor-müəllim heyətinin Nəsimi rayonundakı Akif Abdullayev adına 211 nömrəli tam orta məktəbin müəllim və 11-ci sinif şagirdləri ilə görüşü keçirildi. Görüşü məktəbin direktoru Vaqif Babayev açdı, məktəbdə tədrisin səmərəli təşkilindən, yeni qiymətləndirmə sisteminin tətbiqindən, müəllimlərin hazırlığından, ali məktəblə ümumtəhsil məktəbinin əlaqələrindən, şagirdlərin təlim nailiyyətlərindən danışdı. Sonra İbtidai təhsil fakültəsinin dekanı, pedaqogika üzrə elmlər doktoru, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov ADPU-nun İbtidai təhsil fakültəsinin tarixi, bu günü və inkişaf perspektivləri haqqında geniş məlumat verdi. Qeyd etdi ki, ADPU-nun İbtidai təhsil fakültəsi 1958-ci ildə təşkil olunmuşdur. Fakültənin inkişafında akademik Mehdi Mehdizadənin, professor Mərdan Muradxanovun, dosent Əfşan Qədimbəyovanın, fakültənin dekanı vəzifəsində çalışmış dosent İsfəndiyar Vəlixanlının (1959-1969), professor Nəmidə Abbasovanın (1969-1976), dosent Musa Həsənovun (1976-1989), professor Xəlil Fətəliyevin (1990-1997), professor Zahid Xəlilovun (1998-2005) və dosent Zabit Məmmədovun (2005-2006) mühüm xidmətləri olmuşdur. Fakültədə məqsədimiz yeni düşüncəyə, təhsil-tərbiyə texnologiyasına, mənəvi və əxlaqi saflığa, yüksək peşə və ixtisas hazırlığına, ümummədəni kompetensiyalara malik ibtidai sinif müəllimi hazırlığından, missiyamız İbtidai təhsil fakültəsində təhsilverici, tərbiyəedici və inkişafetdirici təlim mühiti yaratmaqdan, hədəfimiz ibtidai sinif müəllimi hazırlığında yüksək maddi-texniki bazaya, peşəkar professor-müəllim heyətinə, müasir tələblərə cavab verən mükəmməl təhsil proqramlarına malik fakültə olmaqdan ibarətdir.



Bu məqsədlə fəaliyyətimizdə aşağıdakı dəyər və prinsipləri rəhbər tuturuq:

Keyfiyyətli təhsil xidməti;

Tələbə nailiyyətlərinin obyektiv və şəffaf qiymətləndirilməsi;

Müəllim-tələbə əməkdaşlığı;

Təhsil-tərbiyə prosesinin təşkilində peşəkarlıq;

Müəllim və tələbələrə humanist münasibət.

Daha sonra professor F.Rüstəmov fakültənin strukturu, ixtisaslar, kadr potensialı, məzunlar, elmi-pedaqoji əlaqələr, pedaqoji təcrübə, tədrisin təşkili haqqında ətraflı məlumat verdi. Tədbirdə şagirdlərin və müəllimlərin müxtəlif sualları fakültə dekanı, professor F.Rüstəmov, dekan müavini, dosent Afət Həsənova, məktəbin direktoru V.Babayev tərəfindən cavablandırıldı, onlar 15 aprel 2017-ci ildə, saat 11:00-da ADPU-nun Böyük Akt zalında keçiriləcək ”Açıq qapı” gününə dəvət edildilər.

# ADPU-nun nəzdində ADPK-də “Ulu öndər Heydər Əliyevin Azərbaycan Milli Kitabxanasına hədiyyə etdiyi şəxsi kitabları” mövzusunda sərgi-konfrans

Aprelin 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) Azərbaycan Milli Kitabxanası və Bakı Dövlət Universitetinin (BDU) Kitabşünaslıq və nəşriyyat işi kafedrasının iştirakı ilə ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş “Ulu öndər Heydər Əliyevin Azərbaycan Milli Kitabxanasına hədiyyə etdiyi şəxsi kitabları” mövzusunda sərgi-konfrans keçirilmişdir. Konfransda BDU-nun Kitabşünaslıq və nəşriyyat işi kafedrasının dosenti, fəlsəfə doktoru Rasim Süleymanov, Yasamal Rayon İcra Hakimiyyətinin səlahiyyətli nümayəndəsi Zöhrab Cəfərov, Azərbaycan Millli Kitabxanasının direktoru, professor Kərim Tahirov qonaq qismində iştirak etmişlər.




Əvvəlcə konfrans iştirakçıları ümummilli lider Heydər Əliyevə həsr olunmuş kitab sərgisi ilə tanış olmuşlar. Sonra ulu öndər Heydər Əliyevin kitabxanada 3 iyun 1995-ci il çıxışına dair qısa videofilmin nümayişi olmuşdur.

Konfransı giriş sözü ilə açan kollecin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov Ulu Öndərin həyat yolunun və irsinin bugünkü gənclər tərəfindən dərindən öyrənilməsinin əhəmiyyətini vurğulamışdır.

BDU-nun Kitabşünaslıq və nəşriyyat işi kafedrasının dosenti, fəlsəfə doktoru R.Süleymanov “Ulu öndər Heydər Əliyevin zəngin irsinin öyrənilməsində kitabların əhəmiyyəti və rolu“ mövzusunda məruzə edərək bildirmişdir ki, Heydər Əliyevin ideyaları sırasında milli mədəniyyətin ayrılmaz hissəsi olan kitabxanaların inkişafı xüsusi əhəmiyyətə malikdir. Ulu Öndərin fikrincə, “Kitabxana xalq, millət üçün, cəmiyyət üçün müqəddəs bir yer, mənəviyyat, bilik və zəka mənbəyidir. Ona görə də kitabxanalara daim hörmət xalqımızın mədəniyyətini nümayiş etdirən amillərdən biridir”.

Azərbaycan Millli Kitabxanasının direktoru, professor K.Tahirov “Ulu öndər Heydər Əliyev və Azərbaycanın kitab mədəniyyəti” mövzusunda geniş çıxış etmişdir.

Konfransın sonunda Azərbaycan Milli Kitabxanası tərəfindən ADPK-yə qiymətli kitablar hədiyyə olunmuşdur.

# ADPU-nun Quba Filialında akademik Zərifə Əliyevanın anadan olmasının 94-cü ildönümünə həsr edilən məqalə müsabiqəsi keçirilib

Aprelin 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında tələbə-gənclərin fəal iştirakı ilə xalqımızın görkəmli oftalmoloq alimi, akademik Zərifə Əliyevanın 94 illik yubileyinə həsr edilən məqalə müsabiqəsi keçirilib. Müsabiqəni giriş sözü ilə filialın tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva açaraq Azərbaycanın səhiyyə sisteminin inkişafında xüsusi xidmətləri olan Zərifə Əliyevanın həyat və fəaliyyəti haqqında ətraflı məlumat verib, sonra məqalələrin oxunulmasına başlanılıb. Məqalələrdə Zərifə Əliyeva yüksək intellekt, geniş erudisiya sahibi, insanpərvərlik və fədakarlıq nümunəsi, hamının qəlbində yaşayan qayğıkeş həkim kimi diqqətə çatdırılıb, görkəmli alimin apardığı elmi-tədqiqatlar, qazandığı nailiyyətlər, yaratdığı fundamental əsərlər haqqında geniş məlumatlar öz əksini tapıb. Müsabiqədə “İbtidai sinif müəllimliyi” ixtisasının I tədris ilinin 126-cı qrup tələbələri Günay Məcnuni və Natəvan Zeynalova I və II yerlərə layiq görülüblər.



# Tarix və coğrafiya fakültəsində “Açıq qapı günləri” layihəsi çərçivəsində görüşlər

Aprel 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix və coğrafiya fakültəsində“ Açıq qapı günləri” layihəsi çərçivəsində Binəqədi rayon 100 nömrəli tam orta məktəbin “Coğrafiya müəllimliyi” və “Tarix müəllimliyi” ixtisaslarına marağı olan şagirdləri ilə görüş keçirilib. Əvvəlcə şagirdlər Heydər Əliyev Mərkəzi ilə tanış olublar. Fakültənin fəal tələbələri onları fakültənin tədris auditoriyaları, akt zalları, oxu zalı və kitabxanası, yataqxana və yeməkxanası ilə tanış ediblər. Sonra Akt zalında görüş keçirilib. Görüşdə Tarix və coğrafiya fakültəsinin dekan müavini, dosent Mətanət Əsgərova fakültə və tədris olunan ixtisaslar haqqında məlumat verib. Ümumi pedaqogika kafedrasının müdiri, professor İramin İsayevin, həmin kafedranın dosenti Kəmalə Quliyevanın, İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrasının müdiri, dosent Oqtay Alxasovun, həmin kafedranın dosenti Dadaş Ələsgərovun, Tələbə Gənclər Təşkilatının (TGT) fakültə sədri Taleh Budaqovun çıxışları dinlənilib. Sonda fakültə və onun məzunları haqqında slayd-şou göstərilib.



Qeyd edək ki, “Açıq qapı günləri” layihəsi çərçivəsində Tarix və coğrafiya fakültəsinnin müəllimləri aprelin 11-də 42 nömrəli tam orta məktəbdə, aprelin 12-də isə 93 nömrəli tam orta məktəbdə görüşlər keçiriblər.

# Tofiq Bayramın xatirəsinə həsr olunmuş poeziya gecəsi

Aprelin 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad Filialında istedadlı və tanınmış şair, Əməkdar incəsənət xadimi Tofiq Bayramın xatirəsinə həsr olunmuş poeziya gecəsi keçirilib.Tədbirdə filialın direktor müavini Eyvaz Məmmədov, İxtisas fənləri kafedrasının müdiri Yadulla Dadaşlı, müəllim və tələbələri iştirak ediblər.



Şair T.Bayramın həyat və yaradıcılığı haqqında filologiya üzrə fəlsəfə doktoru Y.Dadaşlı geniş məruzə ilə çıxış edib. O, qeyd edib ki, T.Bayram özünəməxsus poeziya nümunələri ilə ədəbi ictimaiyyətin və oxucuların rəğbətini qazanıb, yaşa dolduqca yaradıcılığı püxtələşib, dəyərli və yaddaqalan şeir və poemaları ilə tanınıb.

Tədbirdə digər çıxış edənlər T.Bayramı yüksək bədii istedada, bənzərsiz yaradıcılıq üslubuna malik şair kimi səciyyələndiriblər. Tədbirdə T.Bayramın həyat və yaradıcılığı ilə bağlı fraqmentlər təqdim edilib. Sonra tələbələr şairin şeirlərini səsləndiriblər.

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Yaş və pedaqoji psixologiya kafedrasının müdiri, professor Ərəstun Baxşəliyevə qardaşı

**Baxşəli Baxşəliyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının dosenti Tamilla Vahabovaya əzizi

**Fatmaxanım Bədəlovanın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi universitetin əməkdaşı

**Çingiz Ağayevin**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının dosenti Şərafət Baxışovaya əzizi

**Qurban Alxasovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Nigar ABBASOVA
Məsul katib: Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1267
Sayı: 1500
Çapa imzalanıb: 28.04.2017-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr şöbəsinin kompüter mərkəzində yığılıb, “Azərbaycan” nəşriyyatında səhifələnib və “Azərbaycan” nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.